İÇİNDƏKİLƏR

## BİSMİLLƏHİR-RAHMƏNİR-RAHİM

## XUTBƏTUL HACƏ

Həqiqətən həmd Allaha məxsusdur. Biz Ona həmd edir, Ondan yardım və günahlarımızın bağışlanmasını diləyirik. Nəfslərimizin şərrindən və pis əməllərimizdən Allaha sığınırıq.

Allahın doğru yola yönəltdiyi kimsəni azdıran, azdırdığı kimsəni isə doğru yola yönəldən tapılmaz.

Mən şahidlik edirəm ki, Allahdan başqa ibadətə layiq haqq məbud yoxdur. O, təkdir və şəriki yoxdur. Mən şahidlik edirəm ki, Muhəmməd Onun qulu və elçisidir.“Ey iman gətirənlər! Allahdan layiqincə qorxun. Yalnız müsəlman olduğunuz halda ölün!”[ Al-İmran 102]

“Ey insanlar! Sizi tək bir şəxsdən (Adəmdən) xəlq edən, ondan zövcəsini (Həvvanı) yaradan və onlardan da bir çox kişi və qadınlar törədən Rəbbinizdən qorxun! (Adı ilə) bir-birinizdən (cürbəcür şeylər) istədiyiniz Allahdan, həmçinin qohumluq əlaqələrini kəsməkdən həzər edin!

Şübhəsiz ki, Allah sizin üzərinizdə gözətçidir!”[Nisa1]

“Ey iman gətirənlər! Allahdan qorxun və doğru söz söyləyin! (Belə etsəniz,Allah) əməllərinizi islah edər və günahlarınızı bağışlayar. Hər kəs Allaha və Peyğəmbərinə itaət etsə, böyük bir səadətə nail olar.”[ Əhzab 70-71 ]

Həqiqətən ən doğru kəlam Allahın kitabı, ən doğru yol isə Muhəmmədin (Ona və ailəsinə Allahın salavatı və salamı olsun) yoludur. Ən şər işlər dinə əlavə olunan yeniliklərdir. Hər bir yenilik isə bidət, hər bidət də zəlalətdir. Zəlalətin sonu isə oddur.

## MÜQƏDDİMƏ

Mərhəmətli və Rəhmli Allahın adıyla. Bizi zülmətlərdən nura çıxaran, nemətlərin ən üstünü olan hidayət nemətini bizə bəxş edən Allaha həmd olsun. Başladığımız işdə bizə yardım etməsini diləyir, xata etdiyimiz zaman bizi əfv etməsinə ümid edirik. Bu kiçik kitabçanın yazılmasındaki məqsəd Allahın Adəm əleyhissələmdən Muhamməd salləlləhu əleyhi vəssəlləmə qədər bütün peyğəmbərlərinə əmr etdiyi, onu insanlara çatdırmaqla mükəlləf qıldığı həqiqi İslamı insanlara çatdırmaqdır. Günümüzdə din adına ortaya çıxan yüzlərlə firqələr Allahın dinini təhrif edərək, imanını bunlara təslim etmiş cahil müşrikləri daha da azğınlığa sürükləyirlər. Tövhidi insanlara çatdırmaq, şirki bilib ondan təmizlənmələrini, Tövhidi öyrənib Allaha tövhidlə boyun əymələrini insanlara çatdırmaq bütün Rasulların və Nəbilərin ortaq dəvətləri olmuşdur. Biz müsəlmanların üzərinə düşən isə Məkkə dövründə Allah Rasulunun (s.ə.v) və onun əshabının dəvət etdiyi kimi, insanları ata-babalarından miras aldıqları xurafatdan, şirkdən və küfrdən təmizləmək üçün bu yolda elmlə, əməllərimizlə dəvət aparmaq və bu yoldaki məşəqqətlərə səbr etməkdir. Lakin Allah Rasulunun da bizə qabaqcadan xəbər verdiyi kimi cəhənnəmin qapısında durub ora çağıran dəvətçilər vardır. Din adına insanlara yalanlar uyduran, insanlara küfrü iman olaraq göstərən bu tağutlardan qorunmaq üçün dinimizi usuluyla öyrənmək vacibdir. Çünki usulu bilmədən, nəyin dəlil nəyin şübhə olduğunu ayırd edə bilməsək hər danışan zəlalət əhlinin arxasından gedər və cəhənnəmə sürüklənərik. Allah qorusun! Bəs bu dində usul necədir? Allahın müvəffəqiyyətiylə, bərabər nəzər salaq.

Ey iman gətirənlər! Allaha itaət edin, Rasuluna itaət edin və özünüzdən olan əmir sahiblərinə də. Əgər bir şey haqqında mübahisə etsəniz, Allaha və Axirət gününə inanırsınızsa, Allaha və Onun Elçisinə müraciət edin. Bu sizin üçün daha xeyirli və nəticə etibarilə daha yaxşıdır. [ Nisa 59 ]

Allahu Əzzə və Cəllə burada bizə itaət məsələsində bir sıralama, bir usul təyin etmişdir. Hər məsələdə əvvəlcə Allaha, sonra Onun Rasuluna itaət edilməlidir. Və daha sonra Allah və Rasuluna müvafiq olan, onlara asiliyi əmr etməyən, özümüzdən olan əmir sahiblərinə müraciət edəcəyik.

Burada əmir sahiblərindən qəsd ya idarəçilər ya da alimlərdir. İbn Abbas bu ayəti təfsir edərkən, burada "Ulul-Əmr" alimlərdir deyir. Əmir sahiblərinə sərbəst şəkildə hər məsələdə itaət əmr olunmur.

Peyğəmbər (s.ə.v) 23 illik dəvətin sonunda, Vəda xütbəsində bizlərə daima xatırlamalı olduğumuz bir nəsihət, bir vəsiyyət qoyub getmişdir. Vəda xütbəsində Nəbi s.ə.v belə buyurur:" Qiyamət günü mənim haqqımda soruşulacaqsınız. Nə deyəcəksiniz? Dedilərki "Şahidlik edəcəyik ki, sən bizə bildirdin, sən bizə çatdırdın və sən bizə nəsihət etdin." Allah Rasulu şəhadət barmağını səmaya qaldıraraq: Allahım şahid ol! Allahım şahid ol! Allahım şahid ol! Dedi. [ Hədis geniş şəkildə İmam Muslimin səhihində keçir ]

Eyni xütbədə Allah Rasulu "Sizə iki şey qoyub gedirəm, ona tabe olsanız sapqınlığa düşməzsiniz" deyir. Bunlar nələrdir? Allahın Kitabı və Qiyamət günü Allahın bizdən soruşacağı Rasuluna tabe olmaqdır. Rasulullah (s.ə.v) bizə deyirki, bu ikisinə tabe olsanız sapıqlığa düşməzsiniz. Yəni bunlar xaricindəkilərə tabe olsanız sapıqlığa düşərsiniz. Və bilin ki, möhtərəm müsəlmanlar Allahu Əzzə və Cəllə Qiyamət günündə bizdən falanca alimləri deyil, bu usula tabe olub olmadığımızdan məsul tutacaq. İndi isə hədislərdən və əsərlərdən bu usula dair bəzilərini zikr edək: "Peyğəmbər (s.ə.v) Muaz ibn Cəbəli Yəmənə göndərdiyi zaman aralarında bu dialoq olmuşdur: "Bir məsələ ilə qarşılaşdığın zaman nə edəcəksən?" deyə soruşdu. Muaz(r.a): Allahın kitabıyla hökm verərəm" dedi. Rasulullah: "Onun hökmü Allahın kitabında olmazsa?" Muaz: "Allahın Rasulunun sünnəti ilə hökm verərəm." Rasulullah s.ə.v: "Allah Rasulunun sünnətində də tapılmasa?" Muaz: "Görüşümlə içtihad edərəm.Əlimdən gələni etməkdən geri durmaram" dedi. Muaz r.a deyir ki: Bundan sonra Rasulullah(s.ə.v) əlini sinəmə vurdu və belə buyurdu: "Allahın peyğəmbərinin elçisini, Allahın və Rasulunun razı olacağı şeylərə müvəffəq edən Allaha həmd olsun." [ Əbu Davud,Kitabul Akdiyə.Bab 2.səh.3592;Tirmizi,Kitabu'l-Əhkam bab 3,səh.1327..]

Meymun ibn Mihran rəvayət edir ki: Əbu Bəkirə bir məsələ gəldiyi zaman Allahın kitabına baxardı. Əgər onda hökm verəcək bir şey tapsa aralarında onunla hökm verərdi. Əgər Allahın kitabında belə bir hökm olmaz, və Əbu Bəkir də Rasulullahın sünnətində məsələ ilə əlaqəli bir hökm bilərdisə onunla hökm verərdi. Əgər

bundan da aciz qalardısa çıxıb müsəlmanlardan soruşardı: "Mənə belə-belə bir məsələ gəldi. Sizlər Rasulullahın bu məsələ haqqında hər hansı bir hökm verdiyini bilirsinizmi?" deyə soruşardı. Çox zaman Əbu Bəkirin yanına insanlar toplanar və hamısı o məsələ haqqında Rasulullah tərəfindən verilən bir hökm zikr edərdilər. Əbu Bəkir də: "Aramızda peyğəmbərimizin sünnətini mühafizə edən kişiləri var edən Allaha həmd olsun" deyərdi. Əgər Əbu Bəkir Rasulullahdan bir sünnət tapmaqdan da aciz qalarsa, o zaman insanların öndə gələnlərini bir araya toplayar və onlarla istişarə edərdi. Məsələ haqqında bir görüşdə ittifaq etsələr, onunla hökm verərdi. [ İmam Əd-Dariminin Sünəni ]

Ömər (r.a) özünün təyin etdiyi qazılardan biri olan Şureyhə yazdığı məktubda belə deyir: "Ey Şureyh! Allahın kitabı ilə hökm et. Əgər orada tapa bilməsən elə isə Rasulunun sünnəti ilə hökm et. Əgər onda da tapa bilməsən əvvəlki salehlərin hökm etdiyi şəkildə hökm et! [İmam Nəsai,Kada kitabı]

Eynisini İmam Nəsai İbn Məsuddan da rəvayət edir. Və eynisini İbnu AbdulBərr "Cəmiul Bəyan İlmi və Fadlihi kitabında İbn Abbasdan rəvayət edir.Deməli bu dini öyrənməkdə və anlamaqda, həmçinin nəyin dəlil olaraq alınacağı barədəki usuldur.Eyni zamanda bilməliyik ki, Qurandaki ayələr də möhkəm və mutaşabih olaraq iki qismə ayrılırlar. Necəki hədislərin səhih, zəyif, həsən və s. olduğu kimi. Lakin dəlil ancaq möhkəm ayətlərdən, səhih hədislərdən və mötəbər icmadan alınır."Kitabı sənə nazil edən Odur.O Kitabın bir qismi mənası aydın ayələrdir ki, bunlar da Kitabın anasıdır. Digərləri isə mənası aydın olmayan ayələrdir. Qəlblərində əyrilik olanlar fitnə-fəsad törətmək və istədikləri kimi yozmaq məqsədilə mənası aydın olmayanın ardınca düşərlər. Onun yozumunu isə Allahdan başqa heç kəs bilməz. Elmdə qüvvətli olanlar isə deyərlər: “Biz onlara iman gətirdik, hamısı bizim Rəbbimizdəndir. Bunu isə ancaq ağıl sahibləri dərk edərlər."[Âl-İmrân, 7].

Təqlid isə haramdır. Heçkim, heçkimin sözünü dəlili olmadan təqlid edə bilməz. Dəlili isə:"Rəbbinizdən sizə nazil olana tabe olun. Onu qoyub başqa dostlara uymayın. Siz necə də az öyüd-nəsihət dinləyirsiniz."[Əraf 3]

Allahdan bu yazını bərəkətləndirməsini və bunu bir çox insanın islama gəlməsinə vəsilə etməsini diləyirik. Çalışmaq bizdən, xeyir və müvəffəqiyyət isə Aləmlərin Rabbi olan Allahdandır.

## Rabbimizin Bizi Yaratmazsındaki Qayə Nədir?

Uca Allah Əzzə və Cəllə kitabında buyurur:Mən cinləri və insanları ancaq Mənə ibadət etmək üçün yaratdım.[ Zâriyât, 56]

Burada ibadətdən başlıca qəsd Allahı birləmək, yəni Tövhiddir. "Tövhid sözü ərəbcədə "Vahidun" sözündəndir, "təkləmək", "birləmək" mənasını daşıyır. Bu səbəblədirki, bütün cinlər və insanlar üçün risalətlə göndərilən Muhammәd salləllahu əleyhi vəssəlləm dəvətə Kəlimə-i Tövhidlə başladı.

## TÖVHİD KƏLİMƏSİ - LƏ İLAHƏ İLLALLAH

Mənası: Allahdan başqa ibadətə layiq olan heçbir haqq məbud(ilah) yoxdur. Bu kəlimə, kəlimələrin və elmlərin ən üstünü, peyğəmbərlərin göndərilmə səbəbi, yaradılmışların arasını kafir və müsəlman deyə ayıran ən əzəmətli kəlimədir.

## TÖVHİDİN 3 NÖVÜ

**1-RUBUBİYYƏT TÖVHİDİ**- Uca Allahı rububiyyətində( yəni rəbb olması, öldürən, dirildən, yaradan, hökm edən və s.) birləməkdir. "De: “Sizə  göydən və yerdən ruzi verən kimdir? Qulaqlara və gözlərə hakim olan kimdir? Ölüdən diri çıxaran, diridən də ölü çıxaran kimdir?

İşləri yoluna qoyan kimdir?” Onlar deyəcəklər: “Allah!” De: “Bəs belə olduğu halda Allahdan qorxmursunuz?”[Yûnus, 31]

De: “Əgər bilirsinizsə, deyin görüm yer və onun üstündə olanlar kimindir?” Onlar: “Allahındır!”– deyəcəklər. De: “Bəs düşünüb ibrət almayacaqsınız?” De: “Yeddi göyün Rəbbi və əzəmətli Ərşin Rəbbi kimdir?” Onlar: “Allahdır!”– deyəcəklər. De: “Bəs qorxmursunuz?” De: “Əgər bilirsinizsə, deyin görüm hər şeyin hökmü əlində olan, himayə edən, Özünün isə himayəyə ehtiyacı olmayan kimdir?” Onlar: “Allahdır!”– deyəcəklər. De: “Bəs necə olur ki, aldanırsınız?” [Mu'minûn, 84-89]

**2 - ULUHİYYƏT TÖVHİDİ**-Keçmişdə və günümüzdəki çəkişmələr daha çox tövhidin bu növündə cərəyan etmişdir. Bu, qulların etdikləri fe'llərdə, yəni dua, nəzir, qurban, ümid etmə, qorxu, təvəkkül, sığınma, yardım diləmə, yönəlmə və s. kimi ibadətlərdə Uca Allahı birləmələri mənasındaki tövhiddir. Bütün bu sadalananlar haqqında Qurani Kərimdə yetərincə dəlil mövcuddur. Bunlardan bəziləri: "Haqq çağırış yalnız Onadır. Müşriklərin Ondan başqa çağırdıqları isə, onlara heç bir şeylə cavab vermirlər. Onlar ağzına su çatsın deyə uzaqdan iki ovcunu suya açan kimsəyə bənzəyirlər. Halbuki o kimsə suyu ovuclayıb içməyincə su onun ağzına çatan deyildir. Doğrusu, kafirlərin duası azğınlıqdan başqa bir şey deyildir.[Ra'd, 14]

Bu belədir. Çünki Allah Haqdır. Kafirlərin Ondan başqa yalvardıqları isə batildir. Həqiqətən,Allah Ucadır,Böyükdür. [ Həcc, 62]

Yalnız Sənə ibadət edirik və yalnız Səndən yardım diləyirik.[ Fatihə 4]

**3-İSİM SİFƏT TÖVHİDİ** - ALLAHI zatında, isim və sifətlərində bir olaraq tanımaqdır. Dəlillərdən bəziləri: De: O Allah Təkdir! Allah Möhtac deyildir.O, nə doğub,nə doğulub,Onun bənzəri də yoxdur [İxlas1-4]

"Ən gözəl adlar Allahındır. Ona bu adlar vasitəsi ilə dua edin və Onun adları barəsində haqdan sapanları tərk edin. Onlar etdikləri əməllərin cəzasını alacaqlar." [A'râf, 180]

Tövhidin bu növündə riayət edilməsi gərəkən 4 qayda var. Bunlar bizi azmış firqələrdən ayırmaq üçün təyin edilən qaydalardır:

1) Təhrif - başqa sözlə əvəz etmək, dəyişmək;

2)Tətil - Allahın sifətlərini tamamilə inkar və ya bəzisini qəbul edib, bəzisini inkar etmək;

3) Təmsil - Allahın sifətlərini məxluqata bənzətmək, buna təşbih də deyilir;

4) Təkyif - Keyfiyyət vermək, fikir yürütmək. Allahın ad və sifətlərində bu qaydalara riayət edilməlidir. Təhrif etmədən, inkar etmədən, bənzətmədən, keyfiyyət vermədən.

## Lə İləhə İllallahın Rukunları

Lə İLAHƏ İLLALLAH kəliməsi inkar və isbat olaraq 2 rukundan ibarətdir.

1. Lə İləhə- inkar

2.İllallah - təsdiq

-ilah özündən qorxulan, çəkinilən, ümid edilən, tələb edilən, ucaldılan, ibadət edilən, bir sözlə desək ibadət və itaət edilib üsyan edilməyəndir. Bu sayılanların hamısı Allaha edilir. Bunlardan birini belə Allahdan qeyrisinə edən kəs ibadətdə şirk qoşmuş və "LƏ İLAHƏ İLLALLAH" sözündəki ixlasını pozmuş olur. Allah subhanə və təalə quranda bir çox yerdə Allahdan başqa ibadət olunanların hamısını ilah adlandırır.

1-ci Rukun: Ona görədə vacibdir ki, mövcud olan bütün batil ilahların hərbirini inkar etdikdən sonra, Allahı tək ilah olaraq qəbul edək.

## TAĞUT NƏDİR ?

Tüğyan sözündəndir. Həddi aşmaq deməkdir.[bu lüğətdəki mənasıdır]

İstilahi, şəri  mənasının izahına keçməzdən əvvəl ümumi məlumat: Alimlərin dəlillərə əsaslanaraq vurğuladıqları, Tağutların əsas və böyükləri beşdir.

1. İblis: Bir zaman Biz mələklərə: “Adəmə səcdə edin!”– dedikdə, İblisdən başqa hamısı səcdə etdi. O imtina edib təkəbbür göstərdi və kafir oldu. [Baqara 34]

2. Allahdan qeyri, özünün razılığı ilə ibadət olunanlar.

3. İnsanları özünə ibadətə çağıranlar.

4. Qeybi bildiyini iddia edən (kahin, falçı, ekstrasens və s.)

5. Allahın hökmü ilə hökm etməyənlər.

Bir hədisdə peyğəmbər (s.ə.v) belə buyurur:

Ümmətim üçün ən çox qorxduğum şey Allaha şirk qoşmalarıdır. Diqqət edin, mən sizə onlar aya, günəşə və ya bütə ibadət edəcəklər demirəm. Lakin Allahdan başqasının əmirlərinə və arzularına uyacaqlar. [ İbn Macə: 4285 ]

İndi isə tağut anlayışını daha ətraflı öyrənə bilmək üçün, birbaşa elmi Rasulullahdan öyrənmiş səhabələrin, onlardan elm almış tabiinlərin və onlardan sonra gələn 3-cü xeyirli nəslin öndərlərinin, həmçinin ümmətin böyük alimlərinin bunu necə fəhm etdiklərini və necə öyrətdiklərinə nəzər salaq: İbn Atiyənin rəvayətinə görə İbn Abbasdan (r.a) ayətdəki "cibt" və "tağut" barədə soruşulduqda o, belə cavab vermişdir: "Cibt - bütlər (Allahdan qeyri ibadət olunanlar), tağut isə onlara xidmət edən tərcüməçiləridir. Çünki bunlar bütlərin adından bəzi şeylər uydararaq xalqı sapdırırlar. " [ ət-Təbəri, Cəmiul-Bəyan 7/35; Abdurrahman b. Əbi Hatim, Təfsirul-Qurani'l-Əzim 2/495; Əl-Məverdi, ən-Nukətu və'l-Uyin, 1/495]

Qeyd: Səhabənin qeyd etdiyi bu tağut növü günümüzdədə çox yayğındır. Məsələn: Allahdan qeyri hökmlərə tabe olmağa çağıran *"drar məscidi" imamları, ölmüş bəzi şeyxlərə, qəbirlərə, ağaca və s. ibadət etməyə çağıran və onların da sizdən nə istədiklərini söyləyən bəzi sufi, tasavvufçu və s. kimsələr də bu cür tağutlardır. Habelə bənzəri Cəhmiyyə və murciyə dəvətçiləri kimi **"Bəlamları" da tağutun bu qisminə misal göstərmək olar.

Ömər(r.a) tağut şeytandır demişdir. İbn Kəsir onun bu sözünə şərh verərkən bildirirki "bir şeyin mənbəyi, qaynağı nədirsə ona nisbət edilməsi daha doğrudur.

Hər cür tuğyanın qaynağı şeytan olduğundan Ömər (r.a) belə demişdir." Məsələn Allah (c.c) Özündən başqasına ibadət edənləri bizə bildirərkən belə buyurur: "Onlar sadəcə Allahdan qeyri dişi varlıqlara ibadət edirlər, onlar sadəcə azğınlaşmış şeytana dua edirlər.[ Nisa 117 ]. Halbuki məkkəli müşriklər şeytana ibadət etmirdilər. Lakin Uca Allah onların bütlərə və ya dişi hesab etdikləri

mələklərə ibadətlərini "şeytana" ibadət adlandırdı. Niyə? Çünki yer üzündəki bütün şirklərin, küfrlərin, və günahların təməlində şeytan var. Elə bu səbəbə görə sapıqlığın qaynağı kimdirsə ona nisbət olunması daha doğrudur. Ömərin (r.a) sözünün yazıldığı qaynaq:[Təbəri Cəmiu'l Bəyan 6/356; Abdurrahman b. Əbi Hatim, Təfsiru'l-Qurani'l Əzim, 2/495; Məverdi ən-Nukətu və'l Uyin 1/327; İbnul-Cevzi, Zadu'l-Məsir 2/107]

İbn Abbasın tələbəsi olan Mucahid rahimahullah tağut haqqında belə buyurmuşdur: "İnsanların idarəçisi vəzifəsində olan, insanların, işlərini yoluna qoyması üçün hökmünə müraciət etdikləri, insan cildindəki şeytandır. Allahın qanunları xaricində özünə müraciət edilən, insanların əfəndisidir. [Suyuti, əd-Durrul-Mənsur 2/22]

Şeyxul İslam ibni Teymiyyə rahimahullah : "Allaha üsyanla bağlı xüsuslarda, hidayət və haqq dinə uymamaqda özünə itaət olunan hərşey Tağutdur. Beləcə Allahın kitabından başqa şeylərlə hökmedən və bu məqsədlə hökmünə müraciət edilən şəxsə tağut adının verilməsi bu səbəblədir. [ Məcməul Fətəva28/200]

İbnul Qeyyim əl-Covziyyə: "Hər qövmün tağutu, Allah və Rasulu xaricində hökmünə baş vurduqları, Allahı buraxıb bəsirətsizcə Allah xaricində tabe olduqları və yaxud Allahdan başqa itaət etdikləri kimsələrdir. Kim Rasulullahın(s.ə.v) gətirdiyinin xaricində bir şeyin hökmünə baş vurar və ya o şeylə hökm verərsə tağut ilə hökm etmiş ya da tağuta mühakimə olmuşdur." [ İ'lamul-Muvakkin, 1/50 ]

Bunlar sələfin böyüklərindən sadəcə bir neçəsidir. Başda qeyd etdiyimiz tağut qavramı haqqındakı yazı bu dəlillərin cəmi əsasında yazılıb.

## BƏS TAĞUTU NECƏ İNKAR EDƏK?

TAĞUTU İNKAR ETMƏNİN SİFƏTİ VƏ TAĞUTA KÜFR ETMƏK:

1) Allahdan başqasına ibadətin batilliyinə etiqad etmək: ...Çünki Allah haqq, Ondan başqa ibadət etdikləri isə batildir...[ Həcc 62 ]

2) Ondan başqasına ibadəti tərk etmək. Allah Əzzə və Cəllə Quranda bizi tağutla əlaqəli 2 şeydən məsul tutmuşdur.

a) tağuta küfr etmək: Dində məcburiyyət yoxdur. Artıq doğru yol azğınlıqdan aydın fərqlənir. Hər kəs tağutu inkar(küfr) edib Allaha iman gətirərsə, heç vaxt qırılmayan ən möhkəm dəstəkdən yapışmış olar. Allah Eşidəndir, Biləndir.[ Baqara 256 ]

b) tağutdan ictinab etmək - bu isə birincidəkindən daha geniş mənaya sahibdir. İctinab kəliməsi ərəbcədə "cənb" kəliməsindəndir. İctinab kəliməsi bir şeydən qaçmaq, çəkinmək, bir şeyi bir tərəfə, özünü isə başqa tərəfə qoymaq kimi mənalara gəlir. Yəni aralarında tam bir ayrılıq və düşmənçiliyin olmasıdır. Buna görə də Allah Əzzə və Cəllə peyğəmbərlərin bu kəliməyə dəvət etmələrini istəmişdir: "Tağuta ibadət etməkdən çəkinib tövbə edərək Allaha tərəf yönələnlərə müjdə vardır. Bəndələrimi müjdələ" [Zumər 17]

3) Ondan başqasına olan ibadətə və bu ibadəti edənlərə buğz (kin, nifrət) etmək. Çünki bu dinin əslidir. "Siz bir olan Allaha iman gətirincəyə qədər bizimlə sizin aranızda daim ədavət və nifrət olacaqdır!” [mumtəhinə 4]

4) Ondan başqasına ibadət edənləri təkfir etmək:"..sizi inkar(təkfir)edirik.."[ Mumtəhinə 4]

Baxaq Allah Rasulu (s.ə.v) şirkdən tövbə edib, təbərri etməyi necə öyrətmişdir: Novfəl əl-Əşcai r.a rəvayət edir. Bir gün peyğəmbərə (s.ə.v) baş çəkdim və "Ey Allahın Peyğəmbəri, mənə elə bir şey öyrət ki, yatağıma girəndə onu oxuyum" dedim. Peyğəmbər (s.ə.v) belə buyurdu: "Yatağına girəndə "De ki ey kafirlər! (kafirun)" surəsini oxu. Sonra yat. Çalış ki, bu oxuduğun son surə olsun! Heç şübhəsiz bu surə səni şirkdən uzaqlaşdırar." [Sünən-i Əbu Davud, 5055-səhihdir; Sahihu't-Tirmizi, 3643 ]

Bu surəyə əsasən şirkdən təbərrini 3 maddədə izah edə bilərik:

1) De ki, ey kafirlər! -yəni əvvəlcə şirkdən tövbə edib onlardan bəri olmaq üçün şirki işləyənlərin müşrik və kafir olduqlarına etiqad etmək gərəklidir. Sonra isə

2) Mən sizin ibadət etdiklərinizə ibadət etmərəm - və sən onların Allahın xaricində

ibadət etdiklərindən bəri olduğunu ifadə edəcəksən. Və sən son ayətdəki kimi:

3) 6- Sizin dininiz sizə, mənim dinim də mənə-yəni onların da bir din üzərində olduğuna etiqad edəcəksən ki, şirk də bir dindir. Rasulullahın bu ayəni oxuduğu məkkəli müşriklər nə yəhudi, nə xristiyan nə də bütpərəst deyildilər. Onlar da bugünki, müşriklər kimi özlərini İbrahim (ə.s)-ın hənif dininə nisbət edirdilər.

5) Onlara düşmənçilik etməyindir: "(İbrahim) demişdi: İndi nəyə ibadət etdiyinizi görürsünüzmü? Sizin və ulu babalarınızın? Aləmlərin Rəbbi istisna olmaqla, onlar mənim düşmənlərimdir." [Şuara 77]

Tağutu inkarın bu beş sifətinin dəlilinə gəlincə: "İbrahim və onunla birlikdə olanlarda sizin üçün gözəl bir nümunə vardır. Onlar öz qövmünə dedilər: “Həqiqətən, biz sizdən və sizin Allahdan başqa tapındığınız şeylərdən uzağıq. Biz sizi inkar edirik. Siz bir olan Allaha iman gətirincəyə qədər bizimlə sizin aranızda daim ədavət və nifrət olacaqdır!” Yalnız İbrahimin öz atasına: “Mən sənin üçün mütləq bağışlanma diləyəcəyəm. Fəqət Allahdan sənə gələn əzabı dəf edə bilmərəm!”– deməsi istisnadır. Onlar dedilər:  “Ey Rəbbimiz! Biz yalnız Sənə təvəkkül edir və yalnız Sənə üz tuturuq. Dönüş də yalnız Sənədir."[ Mumtəhinə 4]

2-ci Rukun İllallahın mənası isə bütün ibadətləri yalnız Allaha yönəldərək,Onun təkliyini isbat etməkdir.

## İBADƏT NƏDİR?

Bu  Uca Allahın sevib razı qaldığı bütün əməllər və sözlərdir.

Bədənin ibadətləri: Namaz, oruc, həcc, cihad

Qəlbin ibadətləri: Sevgi, qorxu, təvəkkül, ixlas və s.

Dilin ibadətləri: Zikr, dua, quran, dəvət və s.

Malla ibadət: Zəkat, nəzir, sədəqə və s.[Ər-Risalət-Ul-Mufidə səh: 16]

Bəzi ibadət növlərinin dəlilləri: Namazın, zəkatın və tövhidin təfsirinin dəlili:"Halbuki onlara, dini məhz Allaha məxsus edərək, həniflər kimi ibadət etmək,

namaz qılmaq və zəkat vermək əmr olunmuşdu. Doğru din də elə budur! "[Bəyyinə, 5]

Orucun Dəlili: "Ey iman gətirənlər! Sizdən əvvəlkilərə vacib edildiyi kimi, sizə də oruc tutmaq vacib edildi ki, bəlkə pis əməllərdən çəkinəsiniz." [Baqara 183]

HƏCCİN dəlili: "Orada aydın nişanələr – İbrahimın məqamı vardır. Oraya daxil olanın təhlükəsizliyi təmin olunar. Evi (Kəbəni) ziyarət etmək insanların–yoluna gücü çatan hər kəsin–Allah qarşısında borcudur.Kim bunu inkar edərsə, bilsin ki, Allahın aləmlərə ehtiyacı yoxdur."[ Âl-İmrân, 97]

İbadətin hamısı Aləmlərin Rəbbinə edilər.Rəbb ibadət olunanın özüdür: "Ey insanlar! Sizi və sizdən öncəkiləri yaratmış Rəbbinizə ibadət edin ki, bəlkə Allahdan qorxasınız.[Baqara,  21]

Allahın əmr etdiyi ibadət növləri bunlardır: İslam, İman, İhsan, Dua, Qorxu, Ümid, Təvəkkül, Xuşu, İstəmək,Yönəlmək, Sığınmaq, Qurban kəsmək və digər müxtəlif ibadətlər. Həmçinin hökm istəmək, Allahın şəriətinə görə muhakəmə olmaq da bu babdan olduğuna görə, muhakəmə haqqında da bilinməsi vacib olan məsələlərə diqqət edək. Burada eyni zamanda müsirlərin ortaya atdığı bəzi şübhələrə də aydınlıq gətirməyə çalışmışıq.

## MUHAKƏMƏ

Ümumi məlumat: Təhakum- bir ixtilafın, hüsumətin və ya zülmün həll edilib aradan qaldırılması üçün müəyyən bir tərəfdən hökm tələb etməyə deyilir. Yəni iki(və ya çox) tərəfin, ixtilafı üçüncü bir tərəfə hökm verməsi üçün aparmalarıdır. Bu Allaha və Rasuluna, Kitab və sünnətə aparıldığı zaman iman, başqa bir məcraya yönəldildiyi zaman isə küfrdür."Əgər bir şey haqqında mübahisə etsəniz, Allaha və Axirət gününə inanırsınızsa, Allaha və Onun elçisinə müraciət edin...[ Nisa 59 ]

"...Bilin ki, hökm yalnız Onundur..."[Ənam62]

"...Höküm ancaq Allahındır..." [ Ənam 57 ]

" Aralarında Allahın endirdiyi ilə hökm et və onların

arzularına uyma..." [ Maidə 49 ]

"...Höküm yalnız Allahındır. O əmr etmişdir ki, yalnız

Ona ibadət edəsiniz...[Yusuf 40]

Hökm etməyin də qanun qoymağın da Allaha aid olduğu nasslarla çox açıqdır. Bunu Allahdan qeyrisinə isnad edənlərin, tağutlardan hökm tələb edənlərin kafir və müşrik olmalarına açıqlama verərkən eyni zamanda, tağutlardan hökm tələb etməyən lakin haqqında şikayət olduğu üçün daru'l küfrdə özünü müdafiə edən tövhid əhlini, təkfir edənlərə də qısa bir rəddiyə verəcəyik.

Əvvəlcə xatırladım ki, hökm illətə bağlıdır:Sənə nazil edilənə və səndən əvvəl nazil edilənlərə iman gətirdiklərini iddia edənləri görmədinmi? Onlar mühakimə olunmaları üçün tağuta müraciət etmək istəyirlər. Halbuki onlara tağuta inanmamaq əmr olunmuşdur. Şeytan isə onları dərin bir azğınlığa salmaq istəyir.[ Nisâ,60]

Allah subhanəhu və təalə ayətdə açıq bir şəkildə, tağutun önündə muhakəmə olmaq istəyənlərin imanının zənndən ibarət olduğunu deyir.

Bunların kafir olmalarındaki illət, Allahın və Rasulunun hökmündən üz çevirmək və tağuta mühakimə olunmağı istəmələridir. Nisa surəsini 59-dan 61-ə qədər diqqətlə oxuyaq: "Ey iman gətirənlər! Allaha və Elçisinə itaət edin, həm də özünüzdən olan rəhbərlərə şəriətə uyğun şəkildə itaət edin. Əgər bir şey haqqında mübahisə etsəniz, Allaha və Axirət gününə inanırsınızsa, Allaha və Onun Elçisinə müraciət edin. Bu, sizin üçün daha xeyirli və nəticə etibarilə daha yaxşıdır."[ Nisâ, 59]

Burada Allah Əzzə və Cəllə ixtilaf anında Allah və Onun Rasulunun hökmünə müraciət etməyimizi əmr edir. Bəs, Allah və Rasulunun hökmünə müraciət etməyənin halı necədir? deyə soruşsaq, dəvamında belə deyir: "Sənə nazil edilənə və səndən əvvəl nazil edilənlərə iman gətirdiklərini iddia edənləri görmədinmi? Onlar mühakimə olunmaları üçün tağuta müraciət etmək istəyirlər. Halbuki onlara tağuta inanmamaq əmr olunmuşdur. Şeytan isə onları dərin bir azğınlığa salmaq istəyir." [ Nisâ, 60]

Bu insanların kafir olmalarındaki illətin Allah və Rasulunun hökmündən üz çevirmələri olduğuna dəlil nədir? Deyə soruşsaq: "Onlara: “Allahın nazil etdiyinə və Elçisinə tərəf gəlin!”– deyildikdə, münafiqlərin səndən nifrətlə üz çevirdiklərini görürsən."[ Nisâ, 61]

Ayətlərdən küfrün illətini öyrəndikdən sonra, özünü savunanın/müdafiə edənin bunlarla qiyas olunmayacağını da anlayırıq.

Münafiqlər: “Allaha və Peyğəmbərə iman gətirdik, itaət etdik!”– deyirlər. Bundan sonra isə onlardan bir dəstə üz çevirir. Onlar mömin deyillər.[ Nûr,47]

Xeyr! Sənin Rəbbinə and olsun ki, onlar öz aralarında baş verən çəkişmələrdə səni hakim hesab etməyincə, sonra da verdiyin hökmlərə görə özlərində bir sıxıntı duymadan tam təslim olmayınca iman gətirmiş olmazlar.[ Nisâ,65]

Əl-Qasimi deyirki : Bu ayə Rasulullahın hökmündən razı olmayanın təkfirinə dəlildir.[Əl-Qasimi Məhasinut Təvil 3.cild səh:195]

Başda savunmanı( özünü müdafiə etmə, təmizə çıxartma) küfr görənlər haqqında yazmağı düşünmürdüm. Lakin bəzi müsəlmanları sapdırdıqları üçün və həmçinin qardaşların da xaişi üzərinə məsələyə qısaca nəzər saldıq. Yazmağı düşünməməyimin səbəbi o idi ki, usula əsasən dəlil gətirmək iddia sahibinə aiddir. Bu bidət əhli kimsələr isə öz batillərini isbat edə bilmədikləri kimi, 1400 ildə onlar kimi düşünən tək bir alim belə göstərə bilmirlər. Yuxarıdaki ayətləri dəlilmiş kimi göstərsələrdə bu ayətlərin kimlərə şamil olunduğunu illətləriylə bərabər açıqladıq.

Bir başqa şübhədə isə dəlil təqdim edib onlara(tağutlara) qarşı özlərini müdafiə edən tövhid əhlini təkfir edə bilmək üçün aşağıdakı hədisi qiyas edərək şübhələrini isbat etməyə çalışırlar:

"Dəlil təqdim etmək iddia sahibi üçün, and içmək isə əleyhində iddia olan kəs üçündür."[Bənzər ləfzlərlə Buxari; Muslim; Bəyhaqi; İmam Əhməd]

Deyirlər ki, bu hədisdən anlayırıq ki, ixtilafını qadıya aparan kəs muhakəmə olunduğu kimi, üzərinə bir həqiqət və ya iftira atılan kəs məhkəməyə icabət edib, iddialara cavab verdiyi zaman muhakəmələşmiş olur.

Şübhəyə cavab: Bu hədisdə İslam dövlətində olan, qadıya qarşı edilməsi gərəkli olan vəzifələr zikr edilmişdir. Bu qayda küfr məhkəmələrində tətbiq edilmədiyi üçün bu hədisi dəlil olaraq gətirmək batildir. Fiqhdə qaydadır: İki şey bir-birinə bənzəyərsə qiyas edilər. İslam məhkəmələrində hökmlər Quran və Sünnətə görə ikən, küfr məhkəmələrində hökmlər öz həva və həvəslərinə uyğun yazılan qanunlardır. Elə isə hansı ağıla görə bu ikisini qiyas edə bilərik? Bu məsələylə əlaqəli olaraq Yusuf əleyhissələmin qissəsini və ya Nəmrud zaliminin önündə haqqı deyən və daha sonra haqqında atəşə atılma hökmü verilən İbrahim əleyhissələmin də qissəsini qeyd etməyəcəm. Ey ağıl sahibləri bilin ki biz dəlil gətirmirik sadəcə bəzi misallar göstəririk ki, şübhəyə düşən qardaşlarımıza faydalı olaq.Çünki dəlil gətirmək iddia sahibinə aiddir.

Cəfər ibn ƏbuTalib r.a rəvayət edir: Qureyşlilər Amr b.As və Ummarə b. Vəlidi Əbu Sufyanın verdiyi hədiyyələrlə bərabər Nəcaşinin yanına göndərdilər. Biz Nəcaşinin yanında ikən bunlar gəlib ona belə dedilər: "Bizim aşağı təbəqədən olan və beyinsizlərimizdən bəziləri sənin yanına gəliblər. Onları bizə təslim et." Nəcaşi: "Xeyr onları dinləmədikcə sizə təslim etmərəm" dedi. Nəcaşi xəbər göndərərək bizi hüzuruna çağırtdı. Yanına getdiyimiz zaman bizdən nə dediyimizi soruşdu. Dedik ki: "Bunlar, bütlərə ibadət edən bir qövmdür. Allah bizə bir peyğəmbər göndərdi. Biz də ona iman etdik və onu təsdiq etdik." Sonra Nəcaşi qureyş heyətindən soruşdu: "Bunlar sizin kölələrinizdirmi?" "Xeyr". "Elə isə onların yolundan çəkilin." Belə danışdıqdan sonra Nəcaşinin yanından çıxıb getdik. Bundan sonra Amr b. As ona belə deyib: "Bunlar İsa haqqında sənin düşündüyündən fərqli düşünürlər. "Nəcaşi:"Əgər onlar İsa peyğəmbər haqqında məndən fərqli şeylər deyirlərsə, onları məmləkətində bir an belə saxlamaram!" Nəcaşi bizə təkrar xəbər göndərdi. Bu ikinci çağırışı birincisinə nisbətən daha sərt idi. Bizə belə dedi: "Dostunuz (Muhamməd), Məryəm oğlu İsa haqqında nə deyir?

(Dedik ki, Rasulullah): Onun Allahın ruhu, iffətli və bakirə Məryəmin bətninə yerləşdirdiyi bir kəliməsi olduğunu söyləyir. Nəcaşi: "Mənə falan keşişi və falan rahibi çağırın!" dedi. Gəldikləri zaman: "Məryəm oğlu İsa haqqında nə deyirsiniz?" deyə soruşdu. Onlar: "Sən bizdən daha biliklisən. Sən nə deyirsən?" dedilər. Nəcaşi yerdən bir çöp alıb (çubuq olduğuda rəvayət edilir) belə deyir: "Bunların İsa haqqında dedikləri, bizim onun haqqındaki inancımızdan bu çöp qədər fərqli deyil

dedi və sonra bizə dönərək: "Sizə hər hansı bir kəs əziyyət verirmi?" deyə soruşdu. Biz də "bəli" dedik. Bundan sonra Nəcaşi bir munadi çağırtdırdı və: "Kim bunlara toxunsa cəza olaraq ondan 4 dirhəm alınacaqdır-əmrini verdi. (Sonra) Bu cəza kifayətdirmi? deyə soruşdu.Biz: Xeyr dedik. Bundan sonra cəzanı bir qat da artırdı." [ Əbu Tahir, əl-Muhlisiyat 3.cild 48-48 ]

Qurtubi deyir ki: Bu qissələr, bu kimi hadisələr qiyamət gününə qədər insanlar bunlara əməl etsinlər deyə təqdim olunmuşdur. [ Qurtubi, əl- Cəmiuli Əhkamil Quran 9-cu cild səh:207 ]

Nəcaşi Həbəş krallarına verilən bir isimdir. Şübhəçilərin dediyi kimi bu Nəcaşi hadisənin olduğu zaman müsəlman deyildi. Diqqətlə oxuyana məsələ açıqdır.Köhnə dinindən irtidat etmiş olsaydı keşiş və rahiblərlə istişarə etməzdi. Burada mühakəmə yoxdur deyirsinizsə: ixtilaf və zülm var. Nəcaşi də iki tərəfi dinlədikdən sonra hökm verir və münadi çağırtdırıb yazdırır. Və sonda usulumuza sadiq qalaraq mühakəmə haqqında böyük alim İbnul Qayyim rahimahullahın dediklərini nəzərinizə təqdim edirik: "Kim özü ilə arasında münaqişə etdiyi kəsi Allah və Rasulundan başqasına muhakəmə olunmağa çağırarsa o kəs tağuta muhakəmə olunmuşdur. Halbuki ona tağutu inkar etmək əmr edilmişdir. Qul hökm vermədə yalnız Allahı təkləşdirmədikcə tağutu inkar etmiş sayılmaz." [Tariqul-Hicrateyn səh: 37 ]

## LƏ İLAHƏ İLLALLAHIN ŞƏRTLƏRİ

İslam dinində hər bir ibadətin şərtləri olduğu kimi, həmçinin onu pozan şeylərin də olduğu kimi, tövhidin də şərtləri və onu pozan şeylər var. Bu kəlimənin anlamını bilməyən, şərtlərini və gərəklərini yerinə yetirməyənə heçbir fayda verməyəcəkdir. Şərt kəliməsi lüğətdə əlamət, nişanə, bəlirti mənasına gəlir. Bizi maraqlandıran qismi isə bu deyil. Məsələmizlə əlaqəli olan isə şəriətdə Usul elmində şərt kəliməsinin nə mənaya gəldiyidir. Şamın böyük alimlərindən birisi olan Mustafa Said əl-Hınn şərt kəliməsini belə tərif edir: Şərt:öz yoxluğunda məşrutun(şərt qoşulan şeyin) da yoxluğunun gərəkdiyi,amma varlığında məşrutun varlığının gərəkmədiyi şeydir.[Əl-Kafi'l-Vəfi fi Usuli'l-Fikhi'l-İslami,s.32, Muəssəsətu't Risalə]

Vəhbə Zuhayli də hardasa eyni ləfzlə şərt kəliməsini tərif etmişdir.[Usulu'l Fikhu'l İslam 1/99]. Usul alimlərinin demək olarki hamısı bənzəri təriflər veriblər. Vəhb b. Munəbbih rahmətullahi əleyhidən "Lə ilahə illallah cənnətin açarı deyilmi?" deyə soruşan bir kimsəyə, o belə cavab vermişdir: "Bəli,lakin hər açarın dişləri vardır. Əgər dişli açar gətirərsənsə qapı sənin üzünə açılar. Yox əgər açarın dişləri olmazsa qapı açılmaz."

**1.ELM:** "LƏ İLAHƏ İLLALLAHIN" mənasını dəlilləriylə bilməkdir. Bu kəlimənin başlanğıcı inkar, davamı isə təsdiqdir. Bu söz Allahın xaricindəki bütün batil ilahları ortadan qaldırır. Elmə dəlil: "Bil ki, Allahdan başqa ibadətə layiq olan heç bir məbud yoxdur. Sən həm öz günahlarının, həm də mömin kişilərlə mömin qadınların bağışlanmasını dilə. Allah gəzib-dolaşdığınız yeri də, gecələyəcəyiniz məskəni də bilir." [ Muhamməd,19]

**2.YƏQİN:** Şəkk və şübhəni aradan qaldırır."Möminlər ancaq Allaha və Rasuluna iman edib, sonra da imanlarında şübhəyə düşmədən Allah yolunda malları və canları ilə cihad edən kimsələrdir. Bax sadiq olanlar onlardır." [Hucurat 15]

**3. İXLAS:** Şirki rədd etməkdir. Allah cəllə cələluhu belə buyurur: "Xalis din ancaq Allahındır."[Zumər 3]

"Onlara dini məhz Allaha məxsus edərək, həniflər kimi ibadət etmək, namaz qılmaq və zəkat vermək əmr olunmuşdu. Doğru din də elə budur!" [Bəyyinə 5]

**4. SIDQ:** Nifaqa əngəldir.Münafiqlər isə dilləriylə haqqı söyləyir, fəqət qəlbən inkar edirlər. "Sözsüz ki, Allah doğru danışanları da, yalançıları da aşkara çıxardacaqdır." [Ənkəbut 3]

**5. MƏHƏBBƏT:** Bu kəlimə münafiqlərin əksinə Allahı və Allahın sevdiklərini sevməkdir. "İnsanlardan bəziləri Allahdan başqasını Allaha tay tutar, onları Allahı sevdikləri kimi sevərlər. İman edənlər isə ən çox Allahı sevərlər." [ Baqara 165]

**6. Təslim:** İnqiyad - Allahın qoyduğu bütün qayda-qanunlara, şəriətə və sünnəyə əməl etmək: Bunlar tam bir təslimiyyətin gərəyidir. ALLAH Əzzə və Cəllə buyurur: "Rabbinizə yönəlin və Ona təslim olun." [Zumər54]

**7. QƏBUL:** Bu kəlimənin gətirdiyi hərşeyi qəbul etmək, inkara əsla yol verməmək, Allaha ibadət etmək, şirki və küfrü inkar etməkdir:"Onlara Allahdan başqa heçbir ilah yoxdur deyildiyi zaman təkəbbür göstərirdilər." [Saffət 35]

**MUHAMMƏDUN RASULULLAH**

Tövhid kəliməsi, şəhadət kəliməsi bununla tamamlanır. Allahın tək haqq məbud olduğuna şahidlik etdiyimiz kimi, Muhammədin (s.ə.v) Onun qulu, rasulu və peyğəmbəri olduğuna şahidlik etməyimiz də fərzdir. Onun nəbi olduğuna şəhadətin dəlili: "Sizə özünüzdən elə bir Elçi gəldi ki, sizin əziyyətə düşməyiniz ona ağır gəlir. O sizə qarşı qayğıkeş, möminlərə şəfqətli, rəhmlidir." [Tövbə 128]

Muhəmməd aranızdakı kişilərdən heç birinin atası eyildir. Lakin o, Allahın Elçisi və peyğəmbərlərin sonuncusudur. Allah hər şeyi bilir. [Əhzâb, 40]

Muhammədin ( s.ə.v) Allahın rasulu olduğuna şəhadətin şərtləri bunlardır:

1. Əmr etdiyi şeylərdə itaət etmək

2. Bildirdiyi şeylərdə onu təsdiqləmək

3. Qadağan etdiyi şeylərdən çəkinmək

4. Allaha onun göstərdiyi və öyrətdiyi şəkildə ibadət etmək.

**ŞİRK NƏDİR ?**

**ŞİRKİN NÖVLƏRİ**

Şirk- Allahın haqqını Ondan qeyrisinə verməkdir.

1.BÖYÜK ŞİRK(insanı dindən çıxarır). Allah Əzzə və Cəllə buyurur: " Allah özünə şirk qoşulmasını əsla bağışlamaz, bundan başqa günahları dilədiyinə bağışlayar... [Nisa 48]

**Böyük şirk 4 növdür:**

a) Duada(ibadətdə şirk). "Gəmiyə mindikləri zaman dini yalnızca Allaha xas edərək Ona yalvararlar. Fəqət Allah onları sağ-salamat sahilə çıxartdıqda dərhal Ona şirk qoşarlar." [ Ənkəbut 65 ]

Dünyada ikən Allahdan qeyrisindən şəfaət istəmək böyük şirkdir: Şəriətdə şəfaət kəliməsi, bir kəsin başqa birisinin lehinə Allaha dua etməsi, günahlarını bağışlayıb onu cənnətə daxil etməsi üçün Allahdan tələb etmək mənasına gəlir. İstişfə(şəfaət istəmək) bu səbəbə görə tələbu'd-dua ilə eyni mənaya gəlir.De: “Şəfaət bütünlüklə Allahaməxsusdur. Göylərin və yerin hökmranlığı da Ona məxsusdur. Sonra siz Ona qaytarılacaqsınız”. [ Zumər 44 ]

"Onlar (müşriklər) Allahı buraxıb özlərinə nə zərər nə də fayda verəbiləcək şeylərə ibadət edirlər və bunlar Allah qatında bizim şəfaətçilərimizdir deyirlər" [ Yunus 18]

Bil ki, şəfaət Allahın mülküdür və yalnızca ona aiddir. Rasulullah da (s.ə.v) daxil olmaqla heç kəsin şəfaətdə hər hansı bir payı yoxdur. Beləliklə yalnızca Allaha aid olan bir şeyi başqasından istəmək böyük şirkdir və bu əməl sahibi də müşrikdir.Lakin səhih hədislərdən bizə çatana görə Allahu Təalə Qiyamət günündə Rasulullaha (s.ə.v), Allahın da özlərindən razı qaldığı kəslərə şəfaət etmə haqqı verəcəkdir. Eynilə şəhidlərə, saleh dostlara, buluğ yaşa çatmadan ölən uşaqlara və s. Amma bu qiyamət günündə olacaq,bu dünyada yox. Şəfaətin caiz olanı Allahdan istənilən və

Qiyamət günü Allahın, əməlindən və sözündən razı olduğu kəslərə iznindən sonra verdiyi şəfaət haqqıdır. Bu isə şəfaətçiyə Allahın ikramıdır. Onun izni olmadan isə heç kəs şəfaət edə bilməz: "Onun izni olmadan kim şəfaət edə bilər?" [ Baqara 255 ]

"...Yalnız Onun icazəsindən sonra kimsə şəfaətçi ola bilər." [ Yunus 3 ]

Göylərdə neçə-neçə mələklər vardır ki, onların şəfaəti Allahın istədiyi və Özünün razı qaldığı kimsələrdən başqa heç kəsə heç bir fayda verməz. [ Nəcm 26 ]

Əhli Sünnətə müxalif olan zəlalət əhlinin yalnış anladığı hədisi nəzərinizə çatdıraraq bu babı sonlandırırıq. Buradan sizədə aydın olacaq ki, bu şəfaət haqqı qiyamət günü veriləcək və qeybdən olandan deyil yanına gedərək istəniləcəkdir.

1. Əbu Hureyra (r.a) rəvayət edir ki, bir gün Peyğəmbərə (s.a.v) cəmdək gətirdilər. Sonra bu cəmdəyin bel tərəfini (bişirib) ona verdilər. Ətin bu yeri onun xoşuna gəlirdi. O, ətdən bir tikə dişlədikdən sonra dedi: «Qiyamət günü mən insanların ən hörmətlisi olacağam. Bunun nə səbəbdən belə olduğunu bilirsinizmi? Allah (bütün) insanları-əvvəlkiləri və sonrakıları elə bir yerə yığacaq ki, carçı onları çağıra bilsin, gözlər də onları əhatə etsin. Günəş insanlara yaxınlaşdıqdan sonra onları elə bir dərd və kədər bürüyəcək ki, onların buna tab gətirməyə və dözməyə gücü çatmayacaq. Onda onlar bir-birlərinə deyəcəklər: «Başınıza gələnləri görmürsünüzmü? Bəlkə, Rəbbiniz yanında sizin tərəfinizi saxlayan bir adam tapasınız?» Bəziləri deyəcək: «Gərək Adəmdən xahiş edəsiniz!»

Onlar Adəmin yanına gəlib deyəcəklər: «Sən bəşəriyyətin atasısan! Özünü də Allah öz əlləri ilə yaratmış, öz ruhundan sənə üfürmüş və mələklər Onun əmri ilə sənə səcdə etmişlər. Odur ki, Rəbbinin yanında bizdən ötrü havadarlıq et (şəfaətçi ol)! Məgər sən bizim nə vəziyyətdə olduğumuzu, başımıza nələr gəldiyini görmürsənmi?!» Adəm deyəcək: «Bu gün Allah elə qəzəblənmişdir ki, O bundan əvvəl heç vaxt belə qəzəblənməmiş və bundan sonra əsla belə qəzəblənməyəcəkdir. Çünki O mənə ağaca yaxınlaşmağı qadağan etdi, lakin mən Ona asi oldum. Ah nəfsim, nəfsim, nəfsim! Gedin başqasının yanına. Gedin Nuhun yanına!» Onda onlar Nuhun yanına gəlib deyəcəklər: «Sən yer üzünə göndərilmiş ilk elçisən. Özünü də Allah şükür edən bəndə adlandırmışdır. Odur ki, Rəbbinin yanında bizdən ötrü havadarlıq et! Məgər sən bizim nə vəziyyətdə olduğumuzu görmürsənmi?!» Nuh deyəcək: «Bu gün qüdrətli və qüvvətli Allah elə qəzəblənmişdir ki, O bundan əvvəl heç vaxt belə qəzəblənməmiş və bundan sonra əsla belə qəzəblənməyəcəkdir. Mənim dua etməyə imkanım var idi, lakin mən qövmümün əleyhinə bəddua etdim. Ah nəfsim, nəfsim, nəfsim! Gedin başqasının yanına. Gedin İbrahimin yanına!» Onda onlar İbrahimin yanına gəlib deyəcəklər: «Ey İbrahim! Sən həm Allahın peyğəmbəri, həm də yer əhli arasında Allahın ən sevimli dostusan. Elə isə Rəbbinin yanında bizdən ötrü havadarlıq et! Məgər sən bizim nə vəziyyətdə olduğumuzu görmürsənmi?!» İbrahim deyəcək: «Bu gün qüdrətli və qüvvətli Allah elə qəzəblənmişdir ki, O bundan əvvəl heç vaxt belə qəzəblənməmiş və bundan sonra əsla belə qəzəblənməyəcəkdir. Mən üç dəfə yalan danışmışam. Ah nəfsim, nəfsim, nəfsim! Gedin başqasının yanına. Gedin

Musanın yanına!» Onda onlar Musanın yanına gəlib deyəcəklər: «Ey Musa! Sən Allahın elçisisən, Allah öz risaləti ilə, üstəlik səninlə bilavasitə danışmaqla səni digər insanlardan üstün etmişdir. Elə isə Rəbbinin yanında bizdən ötrü havadarlıq et! Məgər sən bizim nə vəziyyətdə olduğumuzu görmürsənmi?!» Musa deyəcək: «Bu gün Allah elə qəzəblənmişdir ki, O bundan əvvəl heç vaxt belə qəzəblənməmiş və bundan sonra əsla belə qəzəblənməyəcəkdir. Mən adam öldürmüşəm. Halbuki, onu öldürmək mənə əmr edilməmişdi. Ah nəfsim, nəfsim, nəfsim! Gedin başqasının yanına. Gedin İsanın yanına!» Onda onlar İsanın yanına gəlib deyəcəklər: «Ey İsa! Sən həm Allahın Elçisi, həm Onun Məryəmə göndərdiyi Kəliməsi, həm də Onun ruhundansan. Sən hələ körpə ikən, beşikdə insanlarla danışırdın. Elə isə Rəbbinin yanında bizdən ötrü havadarlıq et! Məgər sən bizim nə vəziyyətdə olduğumuzu görmürsənmi?!» İsa deyəcək: «Bu gün Allah elə qəzəblənmişdir ki, O bundan əvvəl heç vaxt belə qəzəblənməmiş və bundan sonra əsla belə qəzəblənməyəcəkdir».İsa öz xətasını onlara bildirməyəcək, sadəcə belə deyəcək: «Ah nəfsim, nəfsim, nəfsim! Gedin başqasının yanına. Gedin Muhəmmədin yanına!» Onda onlar Muhəmmədin yanına gəlib deyəcəklər: «Ey Muhəmməd! Sən həm Allahın Elçisi, həm də peyğəmbərlərin sonuncususan. Allah sənin keçmiş və gələcək günahlarını bağışlamışdır. Elə isə Rəbbinin yanında bizdən ötrü havadarlıq et! Məgər sən bizim nə vəziyyətdə olduğumuzu görmürsənmi?!» Onda mən ərşin altına gəlib, Rəbbimin qarşısında səcdə edəcəyəm. Sonra Allah mənə elə təriflər və alqışlar göndərəcək ki, məndən əvvəl heç kəsə belə təriflər və alqışlar göndərməmişdir. Sonra da belə deyəcək: «Ey Muhəmməd! Başını qaldır və istə, sənə istədiyin veriləcəkdir; havadarlıq et, havadarlığın qəbul olunacaqdır». Mən başımı qaldırıb deyəcəm: «Ümmətim, ey Rəbbim! Ümmətim, ey Rəbbim!» Onda belə deyiləcək: «Ey Muhəmməd! Ümmətindən sorğu-suala çəkilməyəcək kimsələri Cənnətin sağ qapılarından içəri daxil et. Halbuki, onlar başqa insanlarla birlikdə (Cənnətin) digər qapılarından da keçə bilərlər». Peyğəmbər (s.a.v) dedi: «Canım əlində olana and olsun ki, Cənnət qapılarındakı laylardan hər iki lay arasındakı məsafə Məkkə ilə Himyər (yaxud Məkkə ilə Busra) arasındakı məsafə qədərdir»(əl-Buxari 65. Kitəbut-Təfsir 4343, 4435, 4712; ət-Tirmizi 2434. )

2. Digər ləfzdə belə rəvayət olunur: «…(Onda Allah) buyuracaq: «Get, qəlbində arpa dənəsi ağırlığında imanı olan kimsələri atəşdən çıxart!» Mən gedib onları

(oradan) çıxardacağam. Sonra geri dönüb həmin həmd-sənalarla Allaha tariflər deyəcəyəm və Onun qarşısında səcdəyə qapanacağam. Onda mənə deyiləcək: «Ey Muhəmməd! Başını qaldır, danış, sənə qulaq asılacaq, istə, sənə istədiyin veriləcək, havadarlıq et, havadarlığın qəbul olunacaq». Mən deyəcəyəm: «Ey Rəbbim! Ümmətim, ümmətim!» Allah buyuracaq: «Get, qəlbində zərrə qədər və ya xardal dənəsi ağırlığında imanı olan kimsələri atəşdən çıxart!» Mən gedib onları (oradan) çıxardacağam. Sonra geri qayıdıb həmin həmd-sənalarla Allaha təriflər deyəcəyəm və Onun qarşısında səcdəyə qapanacağam. Onda mənə deyiləcək: «Ey Muhəmməd! Başını qaldır, danış, sənə qulaq asılacaq, istə, sənə istədiyin veriləcək, havadarlıq et, havadarlığın qəbul olunacaq». Mən deyəcəyəm: «Ey Rəbbim! Ümmətim, ümmətim!» Allah buyuracaq: «Get, qəlbində xardal dənəsi ağırlığından daha az, daha az, daha az imanı olan kimsələri atəşdən çıxart!» Mən gedib onları (oradan) çıxardacağam». Digər rəvayətdə Peyğəmbər ﷺ demişdir: «Mən dördüncü dəfə qayıdıb həmin həmd-sənalarla Allaha təriflər deyəcəyəm və Onun qarşısında səcdəyə qapanacağam. Onda mənə deyiləcək: «Ey Məhəmməd! Başını qaldır, danış, sənə qulaq asılacaq, istə, sənə istədiyin veriləcək, havadarlıq et, havadarlığın qəbul olunacaq». Mən deyəcəyəm: «Ey Rəbbim! Mənə izn ver: «LƏ İLƏHƏ İLLƏLLAH!» – deyən kimsələrə (şəfaətçi) olum». Allah buyuracaq: «Mənim İzzətimə, Əzəmətimə, Böyüklüyümə və Ululuğuma and olsun ki, Mən: «LƏ İLƏHƏ İLLƏLLAH!» – deyən kəsləri oddan çıxardacağam».(əl-Buxari 97. Kitəbut-Tövhid 6956, 7072, 7510.)

3.Ravi Qatədə deyir ki: «Həmçinin onun belə dediyini eşitdim: «Onları Cəhənnəmdən çıxarıb Cənnətə salacam, hətta Cəhənnəmdə Quranın tutduqlarından, yəni haqlarında əbədi əzab vacib olanlardan başqa heç kim qalmayacaq». Sonra bu ayəni oxudu: «Ola bilsin ki, (buna görə) Rəbbin səni tərifəlayiq bir məqama yüksəltsin» (əl-İsra 79).

Peyğəmbərimizə vəd olunmuş «əl-Məqamul-Mahmud (Tərifəlayiq Məqam)» – budur». (əl-Buxari 97. Kitəbut-Tövhid 66 (6886, 7002, 7440)

b) Niyyət və İradədə şirk: İxlas – insanı sözlərində, əməllərində, niyyətdə və iradədə xalis Allah üçün edir. İbrahimin u hənif dini də elə budur. Bu dindən başqası da qəbul edilmir. Həqiqi din də elə budur. İstək və niyyətdə şirkə gəlincə,

bu sahili olmayan dəniz kimidir. Bu məsələdə şirkdən qurtaran çox az kimsə olur. Əgər bir kimsə əməli ilə Allahdan qeyrisinin razılığını güdərsə və ya hər hansı bir şeylə Allahdan qeyrisinə yaxınlaşmağı niyyət edərsə, Allahdan qeyrisindən mükafat diləyərsə, belə bir kimsə niyyətdə, istəkdə Allaha şirk qoşmuşdur. İnsanlar etdikləri əməlləri ilə dünyanı qəsd edirlər. Riyada insan öz ibadətində maddi bir şeyi istəmir. Lakin bu ibadətdə isə insanlar dünya malını qəsd edirlər. Axirətdə olan savab və mükafatı düşünmürlər. Müəzzin azanı maaşa görə verir. Maaşı kəsiləndə azan vermir. Dünya malını əldə etmək və vəzifə sahibi olamq üçün elm öyrənir. Allahın əmri olduğu üçün deyil, sadəcə sağlamlıq üçün oruc tutur; “Kafirlər Odun qarşısına gətiriləcəkləri gün onlara deyiləcəkdir: “Siz dünya həyatınızda pak nemətlərinizi sərf edib qurtardınız və onlardan zövq aldınız. Bu gün isə siz yer üzündə haqsız olaraq təkəbbür göstərdiyinizə və asi olduğunuza görə alçaldıcı əzabla cəzalandırılacaqsınız!” (əl-Əhqaf 20). “Hər kəs fani dünyanı istəsə, dilədiyimiz şəxsə istədiyimiz neməti orada (dünyada) tezliklə verərik. Sonra isə (axirətdə) ona Cəhənnəmi məskən edərik. O, Cəhənnəmə qınanmış və qovulmuş bir vəziyyətdə daxil olar”. (əl-İsra 18). “Kim dünyanı və onun bər-bəzəyini istəyərsə, Biz ona əməllərinin əvəzini elə orada verərik. Onların dünyadakı mükafatları əsla azaldılmaz. Belələrini axirətdə atəşdən başqa bir payı yoxdur. Onların dünyada gördükləri işlər puç olar və bütün əməlləri boşa çıxar”. (Hud 15-16).

c) İTAƏT və TABEÇİLİKDƏ ŞİRK: "(Yəhudilər) Allahı qoyub alimlərini(hahamlarını), (Xristiyanlar da) Rahiblərini və Məryəm oğlu Məsihi rəbblər qəbul etdilər. Halbuki tək İlahdan başqasına ibadət etməmək əmrolunmuşdu. [Tövbə 31 ]. Nəbi(s.ə.v) bu ayəni oxudu. Bundan sonra Adiyy ibn Hatəm Rasulullaha (s.ə.v) dedi ki: "Şübhəsiz onlar, onlara ibadət etmirlər ki "Rasulullah (s.ə.v):"Onlar Allahın halal etdiyi bir şeyi haram, haram etdiyi bir şeyi halal etdikləri zaman onlara itaət etmirlərmi?" Dedi. Adiyy bin Hatəm: "Bəli" dedikdə, Rasulullah (s.ə.v): "Bax beləcə onlara ibadət edirlər." buyurdu. [Tirmizi, təfsir:10; Təbəri 14/210; Suyuti, Durru'l-Mənsur:3/230; Beyhaqi, Sünənü'l-Kübra]

Hökm vermək- Hakimiyyət səlahiyyətini Allahdan qeyrisinə vermək böyük şirkdir: :"Onlar (yəhudilər) Allahı qoyub hahamlarını və (xristiyanlar da) rahiblərini, bir də Məryəm oğlu İsanı rəbblər qəbul etdilər. Halbuki onlara ancaq tək olan

Allaha ibadət etmək əmr olunmuşdu. Ondan başqa məbud yoxdur. O, bunların şərik qoşduqları şeylərdən uzaqdır." [ Tövbə 31 ]

Rasulullah s.ə.v bu ayəni oxuduğu zaman o vaxt hələ xristiyan olan Adiyy bin Hatim boynunda gümüş bir xaçla gəldi və 《Onlar hahamlara və rahiblərə ibadət etmədilər》dedi. Rasulullah s.ə.v belə dedi: 《 din adamları onlara Allahın halallarını haram, haramlarını da halal etdilər, onlar da bunlara tabe oldular. Beləliklə, bu onların din adamlarına ibadətləridir.》[ İbni Kəsir və Təbəri Tövbə 31-in təfsirində nəql ediblər. Üstəlik Tirmizi də Tövbə surəsi təfsirində 3095 no-lu hədisdə zikr etmişdir.]

Allah Əzzə və Cəllənin ayəti və onu bizə açıqlamaq üçün göndərilən Rasulullahın sözləri onu göstərir ki, Allahın halal və haramlarını dəyiştirmə səlahiyyətini bir başqasına vermək Allah xaricində Rəbb qəbul etmək, yəni başqasına ibadət etməkdir. Hökmün sadəcə Allaha aid olduğunu muhakəmə haqqındakı yazıda geniş şəkildə izah etmişik. Lakin diqqətinizə çatdırmaq istədiyim məsələ budur: Bu gün bu kəliməyi-tövhidi söyləyən və eyni zamanda da demokratik seçkilərdə iştirak edib, seçkilərdə səs verərək Allahın qanunlarını dəyişdirmək, yeniləmə, hökmünü ləğv etmə səlahiyyətini partiyalara və şəxslərə verənlər tövbə surəsi 31-ci ayədə qeyd edildiyi kimi Allahın xaricində ibadət etdikləri rəbblər qəbul etmiş olurlar. Bu niyyətlə etmədiklərini deyənlərə isə deyirik: Əhli kitab da bunun ibadət olduğunu bilmirdi. Lakin bu müşrik olmaları həqiqətini dəyişdirmədi. Çünki şirk bir dindir: Şübhəsiz ki, Qiyamət günü Allah möminlər, yəhudilər, sabiilər, xaçpərəstlər, atəşpərəstlər və müşriklər arasında hökm verəcəkdir. Həqiqətən, Allah hər şeyə şahiddir. [ Həcc 17 ]

İmam Qatədə rahimahullah demişdir: "Dinlər 6-dır. Bunların beşi şeytanındır. Biri isə Ər-Rahmənindir." [ ət- Tabəri, Cəmiul-Bəyəən 18/585 ]

İmam Qatədə rahimahullah Həcc surəsində adı çəkilən bu 6 qismdən möminlərin Ər-Rahmənin dinindən olduğunu, digər beşinin isə şeytanın dinindən olduğunu izah edir. Diqqət etdinizsə əgər Allahu Əzzə və Cəllə şirklərindən dolayı cəhənnəm əhli adlandırdığı, adları da hərkəsə məlum olan dörd dinin adını sadaladıqdan sonra, ayrıca müşriklər deyə vurğulayır. Özünü Tək Allahlılıq dininə nisbət edən,

Hənif İbrahimin (ə.s),və ya Muhammədin(s.ə.v) dininə nisbət etsələr belə şirk edib müşrik olanların başqa bir din üzərə, şirk dini üzərə olduqlarını bəyan edir. Əbu'l Qasim əl-Təbərani, Zeyd bin Harisənin qardaşı olan Cəbələ b. Harisədən rəvayət etdiyinə görə Peyğəmbər s.ə.v belə buyurdu: "Yatağına girəndə Kafirun surəsini sonuna qədər oxu. Şübhəsiz ki, o şirkdən bəraətdir."

İmam Əhməd bunun eynisini Haris bin Cəbələdən də rəvayət etmişdir.

" De ki Ey kafirlər!" ayəsiylə başlayan bu surədəki xitab özlərini İbrahimin (ə.s) hənif dininə nisbət edən məkkəli müşriklərə idi. Surənin sonunda isə belə deyir: " Sizin dininiz sizə, mənim dinim də mənədir!"[Kafirun 6 ]

Yəni insan özünü həniflik dininə də nisbət etsə, Rasullara tabe olduğunu da iddia etsə Allahu Təalə onların şirk dini üzərində olduqlarını bildirir. Hər şeyin ən doğrusunu bilən Allah Pak və Müqəddəsdir.

d) Sevgidə şirk: "İnsanlardan elələri də vardır ki, Allahdan qeyrilərini Ona tay tutur, onları da Allahı sevdikləri kimi sevirlər. İman gətirənlərin isə Allaha olan sevgisi daha güclüdür. Kaş zülm edənlər əzabı gördükləri zaman bütün qüdrət və qüvvətin Allaha məxsus olduğunu və Allahın şiddətli əzab verdiyini görəydilər." [ Baqara,165]

2-KİÇİK ŞİRK _ BU RİYADIR: Rasulullah ( s.ə.v.) belə buyurmuşdur:"Sizin üçün ən çox qorxduğum şey kiçik şirkdir. Səhabələr soruşdular:"Kiçik şirk nədir? Ya Rasulullah!" Rasulullah (s.ə.v) belə cavan verdi: "Riyadır. Cənabı Haqq insanları əməlləri qarşılığında cəzalandıracağı zaman riyakarlara: "Dünyada göstəriş etdiyiniz kəslərin yanına gedin. Onların yanında bir mükafat tapa biləcəksinizmi?" deyəcək." [Əhməd b. Hənbəl]

3- GİZLİ ŞİRK: Rasulullah (s.ə.v) buyurmuşdur:"Bu ümmət içində şirk, zil qaranlıq gecədə qara qarışqaların, qara daşlar üzərində hərəkət etməsi kimidir."Abu Bakr r.a Rasulullah sallallahu əleyhi vəsəlləmə: "Bundan necə xilas ola bilərik?" dedi.Rasulullah sallallahu əleyhi vəsəlləm:" Bu duanı oxusan qurtularsan:"Allahım! Bildiyim şeylərdə şirk qoşmaqdan Sənə sığınıram. Bilmədiyim şirkdən də Sənin əfvini diləyirəm" de." buyurdu.[Hakim, Əbi Hatim səhih sənədlə rəvayət etmişdir.]

# KÜFÜR VƏ NÖVLƏRİ

**Kufr kəliməsi lüğətdə:"Örtmək,gizləmək" deməkdir. Haqqı gizləmək olduğu üçün bununla isimləndirilmişdir.**

**İstilahi mənası isə: İmana zidd olub, onu pozan inanc, söz və ya əməldir.Öyrənilməsi zəruri olan,qəti şəkildə ifadə edilən vacib və ya haram olan hərhansı bir hökmü inkar etmək, dinin əsillərini, vaciblərini inkar etmək və s.**

Bunlar iki növdür:

**1- Böyük küfür:** İslam dinindən çıxaran küfrdür.

Bunlar da beşdir:

**a) Yalanlama (inkar) küfrü:**

Allaha qarşı yalan uyduran və yaxud özünə haqq gəldikdə onu yalan sayan kəsdən daha zalım kim ola bilər? Cəhənnəmdə kafirlər üçün yermi yoxdur? [Ənkəbût, 68]

**b) Təsdiqlə bərabər kibirlənmə və üz çevirmə küfrü:**

"Bir zaman Biz mələklərə: “Adəmə səcdə edin!”– dedikdə, İblisdən başqa hamısı səcdə etdi.O imtina edib təkəbbür göstərdi və kafir oldu.[Baqara, 34]

**c) Şübhə küfrü:** "O özünə zülm edərək bağına daxil olub dedi: “Bunun nə vaxtsa yox ola biləcəyini düşünmürəm." O Saatın gələcəyini də zənn etmirəm. Rəbbimin yanına qaytarılmalı olsam, sözsüz ki, bundan daha firavan bir həyat qismətim olacaq!” Onunla söhbət edən yoldaşı isə dedi: “Səni torpaqdan, sonra nütfədən yaratmış, daha sonra səni kişi qiyafəsinə salmış Rəbbinə küfrmü edirsən? Lakin Allah mənim Rəbbimdir və mən heç kəsi Rəbbimə şərik qoşmaram! [Kəhf surəsi 35-38]

**d) Üz çevirmə küfrü:** "...İnkar edənlər, xəbərdarlıq edildikləri şeylərdən üz çevirməkdədirlər." [Əhqaf 3 ]

Küfrün bu növü günümüzün insanları arasında ən yayğın olanıdır. Bir neçə əsr bundan əvvəl insanlar arasında cəhalət küfrü yayğın idisədə, bugün daha çox

kibirlənmə və üz çevirmə küfrüylə Allahın dinindən üz çevirirlər. Lakin zamandan və məkandan asılı olmayaraq hər kim Allah rasulunun gətirdiyi şəriətdən, bu dinin hökmələrindən üz çevirərsə kafir olar. Al-İmran surəsi 64-cü ayədə Uca Allah belə buyurur: "De ki, ey kitab əhli, sizinlə bizim aramızda olan ortaq kəlimədə birləşək. 1)Tək olan Allaha ibadət edək və 2)heçbir şeyi Ona şərik qoşmayaq, və 3)bir-birimizi Allahdan qeyri rəbblər qəbul etməyək. 4)Əgər üz çevirsələr, de ki, şahid olun mən müsəlmanlardanam.Daha da açıq izah edəcək olsaq, bizdən tələb olunan- Tək Allaha ibadət etmək, Şirk qoşmamaq, bir-birimizi Allahdan qeyri rəbblər qəbul etməmək.Və bu üç şərtdən üz çevirənləri təkfir etmək. "Əgər üz çevirsələr de ki, şahid olun mən müsəlmanlardanam" demək o deməkdirki mən müsəlmanlardanam siz isə müsəlmanlardan deyilsiniz.

**e)Nifaq küfrü:** "Bunun səbəbi,onların əvvəlcə iman edib sonra inkar etmələridir…[Munafiqun 2-3]

Küfrə rza da həmçinin küfrdür: "Möminlər Allah yolunda, kafirlər isə tağut yolunda vuruşurlar..."[ Nisa 76 ]

Bil ki, tağuti sistemdə əsgərlik, polislik, vergi məmuru və s. kimi bu küfr sistemi ayaqda saxlayan vəzifələri icra etmək böyük küfrdür.

" Əbu Hureyra r.a və Əbu Səid əl Xudri r.a Rasulullahın (s.ə.v) belə dediyini rəvayət etmişlər. "Sizə səfih əmirlər hökm edəcək. Onlar insanların ən şərlilərini özlərinə yaxınlaşdıracaq, namaz vaxtlarını da gecikdirəcəklər. Hər kim (belə əmirlərin zamanını) görərsə onlara 《ariyf》olmasın, polis olmasın, vergi məmuru olmasın, mühafizəçi olmasın!" [İbni Hibban, Əbu Yala, Təbərani rəvayət etdi və səhihdir dedi ]

Hədisdəki "ariyf" bir bəldənin və ya qrupun idarəçisi olan, onların halını ölkə idarəçisinə bildirən idarəçi kəsdir. Və hədisdən gördüyümüz kimi səfeh olan, namaz gecikdirən başçılar üçün belə deyilibsə, bugünki din düşmənləri haqqında necə deyərdi özünüz bir düşünün. Ağıl sahibi hər bir müsəlman bilməlidir ki, bu küfr sistemi, islamın və müsəlmanların düşməni olan zalim tağutları dəstəkləyən, onun işlərinə yardım edən və onun sistemini ayaqda saxlayıb gücünə güc qatacaq hər hansı məsələdə onlara yardım edən kəs imanına zülm bulaşdırmış və

kafirlərdən olmuşdur. Əvvəldə bəhs etdiyimiz tağut və onun inkarı barədə olan mövzuları fəhm etmişiksə burada təfsilata gərək yoxdur. Əsgər, polis, hakim, vergi məmuru, vəkil, səfir və s. bənzəri sistem işləri, müsəlmanların nəyinki çalışmayacağı məcralar, hətta müsəlmanlara zülm edən başlıca tağut əsgərləridir. Bugünki drar məscidlərinin imamları da həmin qismdən olan kafirlərdir. Çünki bu dırnaqarası imamlar nəyinki tağutu inkar etmək, hətta onlar üçün dualar edir, cahil topluma onları gözəl göstərməyə çalışır, onlara səs verməyə dəvət edir, bir sözlə tağutlara ibadətə çağırırlar: "Şübhəsiz ki, Allahın nazil etdiyi kitabda olanları gizli saxlayanlar və bununla cüzi miqdarda pul əldə edənlər öz qarınlarına oddan başqa bir şey doldurmurlar. Qiyamət günü Allah onları danışdırmaz və onları təmizə çıxarmaz. Onlar üçün ağrılı-acılı bir əzab vardır. [ Baqara 174 ]

Minbərlər haqqı söyləmə yerləridir. Hətta batil söyləməsə belə haqqıda söyləməyib insanlarda gizlədənlər üçün Allah subhanəhu və təalə buyurur: "Kitabda insanlara bəyan etdiyimiz açıq-aydın dəlillər və doğru yol göstərən ayələr vəhy olunduqdan sonra onları gizli saxlayanlara həm Allah lənət edir, həm də lənət edə bilənlər lənət oxuyurlar! [ Baqara 159 ]

Allaha sığınırıq və Ondan sabitlik istəyirik.Lakin küfr diyarlarında yaşayan müsəlmanlar da rızıqlarını qazanmaq üçün çalışmalıdırlar. Kafirlərin alimlərinin bizlərə atdıqları iftiralardaki kimi biz bütün işləri qadağan etmirik.Bu barədə İbni Həcərin sözü: "Alimlər zərurətdən dolayı müşriklərin yanında işləməyi bu iki şərt xaricində caiz görmədilər.

1) Görülən iş müsəlmanlara halal olmalıdır;

2) Müsəlmanlara zərər verəcək işlərdə müşriklərə yardım olunmamalıdır.

[ Fəthul Bari "İşçi Babı" 4-cü cild səh:452 ]

Digər alimlərdən bu şərtlərə əlavə olaraq 3-cünü əlavə edənlər də olmuşdur.

- Müsəlmanların, müşriklərin yanında görəcəkləri iş onları zəlil hala salmamalıdır.
Ən doğrusunu Allah Əzzə və Cəllə bilir.

Qısa qeyd: Bilki yalnız müsəlmanlar qardaşdırlar. Kafirlərlə dostluq edilməz. Dəvət və ya ticarət kimi dünyavi bir mənfəət xaricində onlarla davamlı ünsiyyət

qadağandır. Çünki dostluq və düşmənçilik bu dinin əsillərindəndir. Möminlər möminləri qoyub kafirləri dost tutmasınlar! Bunu edən kimsə bilsin ki, Allah ilə onun heç bir əlaqəsi yoxdur. Ancaq onlardan gələn təhlükədən çəkinməklə ehtiyat etməyiniz istisnadır...[ İmrân,28]

“Ey iman gətirənlər, yəhudi və xaçpərəstləri dost tutmayın! Onlar bir-birinin dostudurlar. Sizlərdən kim onları özünə dost tutarsa, o da onlardandır. Allah zalım adamları doğru yola yönəltməz.”[ Maidə 51 ]

## KÜFR MƏKTƏBLƏRİ

Allah Kitabda sizə nazil etmişdir ki, Allahın ayələrinin inkar edildiyini və onlara istehza olunduğunu eşitdiyiniz zaman, onlar başqa bir söhbətə keçməyincə onlarla bir yerdə oturmayın. Yoxsa siz də onların tayı olarsınız. Şübhəsiz ki, Allah bütün münafiqləri və kafirləri Cəhənnəmə toplayacaqdır. [ Nisâ,140 ]

Hər uşaq təbii fitrət üzərə (islam yaradılışı) doğular. Sonra valideynləri onu yəhudi, xristiyan və ya məcusi edər. [ Buxari Cəaiz 93; Muslim Qədər 6 ]

Hədisdə qəsd edilən valideynlər o kəslərdir ki, övladları ilə elə səbəblər və elə vasitələrlə davranırlar ki, nəhayət uşaq qeyri-muslimə çevrilir.

Bu səbəblərdən biri isə təhsil bəhanəsi ilə övladları küfr və dinsizlik məktəblərinə vermək, onların tərbiyyə və təhsillərini tağutların və müşriklərin öhdələrinə buraxmaqdır.Əvvəla onu qeyd edim ki, İslam dini təhsilə, tibb, kimya, riyaziyyat və s. bu kimi bənzəri elmlərin öyrənilməsinə qarşı deyil. Buradaki illət, hələ tövhidi, dini öyrənməmiş övladları tağutların planlı şəkildə tərtib etdiyi təhsil müəssisələrinə yollayaraq, uşaqları onların istədiyi şəkildə yetişdirmələrinə izin verməkdir. Küfür tək millətdir. Lakin mən bizim vaqiəmizə uyğun olanını qeyd edəcəm. Ağ kağız kimi saf uşaqlara kafir dövlərlərin atributlarını müqəddəsləşdirib sevdirən, qarşılarında baş əydirən, tağutları uşaqlara sevdirən, küfür sözləri əzbərlədib onlara söylədənlər bu təhsil müəssisələridir.

**Sənsiz neynəyirəm qürbət eldə günü mən Sənsiz neynəyirəm Allahı mən dini mən** kimi şe'rləri uşaqlara əzbərlədənlərin islamla və müsəlmanlıqla bir bağının

olması mümkündürmü? İlk insanlar meymuna bənzəyən və sadəcə heyvanlar kimi ov edərək yaşayan varlıqlar idi deyən, Allahın isə öz kitabında, əlləriylə yaradıb Öz ruhundan üflədiyi ilk insan Adəm əleyhissələm olduğunu bildirdiyi halda bunu inkar edənlər övladlarımıza nə fayda verə bilərlər? Əksinə Allaha və dininə savaş açmış bu tağutlar məcburi təhsil adı altında özlərinə əsgərlər yetişdirirlər. Bir düşün möhtərəm oxucu. İşsizliyin və yoxsulluğun baş alıb getdiyi, heç kəsin heç kəsə yardım etmədiyi, mənfəət güddüyü bir toplumda yaşayırıq. Acları doyurmayan, yoxsullara yardım etməyən, xəstəxanalarda belə qarşılıqsız heçbir xəstəyə yardım göstərməyən bu tağut dövlətləri niyə təhsil müəssisələrini pulsuz ləvazimat, kitab və geyimlə təchiz edirlər? Bu qədər çoxmu sevirlər bizi?Doğrudanmı elmli olmağımızı istəyirlər? Xeyr!Övladlarımızı kafirlərə bənzətsinlər deyə. Onlara kafirlərin bayramlarını qeyd etdirsinlər deyə.Kafirlərin övladları ilə müsəlmanların  övladlarını həşr-nəşr edib onlara bənzətsinlər deyə. Əvvəldə qeyd etdiyimiz ayətdəki kimi ...yoxsa siz də onların tayı olarsınız… [Nisa 140]

Onların tayı olmamaq üçün, övladlarımızın kafirlərə bənzəməsinə rıza göstərənlərdən olmamaq üçün: "Ey iman gətirənlər! Özünüzü və ailənizi yanacağı insanlar və daşlardan olan oddan qoruyun!... [ Təhrim 6]

Baxın möhtərəm oxucu! Nisa surəsi 140-cı ayənin sonunda Allah subhanə və təalə, Onun ayələrinin inkar edildiyi və onlarla istehza olunduğu yerdə oturanlara deyir ki:"Şübhəsiz ki, Allah bütün münafiqləri və kafirləri bir araya toplayacaqdır."

Münafiqlərdən və kafirlərdən olmamaq üçün düşün! Düşün! Çünki bu din ağıl sahibləri üçündür.

2.Kiçik küfr:  Kiçik küfr, insanı dindən çıxartmayan və şəfaətçilərin şəfaətinin fayda verdiyi küfürdür.Bunlar, Quran və Sünnətdə küfür olaraq isimləndirilən günahlardır. Bu günahlar dinin əslini pozmayan,lakin imanı azaldan və zəyiflədən əməllərdir. Bu səbəblə bunlardan dərhal tövbə edilməlidir. Beləki, bu növ küfrlərin faili olan bir insan bundan tövbə etmədiyi halda cəhənnəmdə əbədi qalmamaq üzərə Allahın qəzəbinə düçar olmaq təhlükəsiylə qarşı qarşıyadır.

Kiçik küfrün bir neçə növü vardır:

1.Neməti inkar/nemətə nankorluq. Bu nemətin Allahdan olduğunu bildiyi halda nankorluq etmək və başqa səbəblərə bağlamaqla ortaya çıxır.

2. Allahdan başqasının adına and içmək: And içən and içdiyi şeyə hörmət etdiyindən uca və şərəfli qəbul etdiyindən ötürü and içir. Bu səbəblə Allahdan başqası adına and içmək kiçik küfrdür. Lakin and içdiyi şeyə Allahdan çox hörmət edər və ya eyni dərəcədə hesab edərsə bu böyük küfr olar. 3.Müsəlmanlarla savaşmaq: Abdullah ibn Məsud r.a Rasulullahdan(s.ə.v) belə rəvayət edir:" Müsəlmanı söymək fısq, onunla vuruşmaq isə küfrdür."[Buxari 48; Muslim 116]

## İslamı pozan başlıca şirk və küfr növləri bunlardır:

**1. Allaha ibadətdə şirk qoşmaq:** "Allah Özünə şirk qoşulmasını əsla bağışlamaz. Bundan başqa günahları dilədiyinə bağışlayar." [ Nisa 48]

**2. Allah ilə arasına vasitələr qoşmaq**, onlara dua etmək və ya şəfaət istəmək. Bunları edən Quran, Sünnə və İcma ilə kafir olur.

**3. Müşrikləri və kafirləri təkfir etməmək**, onların küfründə şübhə etmək və ya onların doğru yolda olduqlarına etiqad etmək küfrdür. Çünki bu əməl sahibləri Quran və sünnədəki nassları, həmçinin icmanı inkar etmiş kafirlərdir. "...Bizim ayələrimizi yalnız nankor xainlər inkar edərlər." [ Loğman 32 ]

Beləcə, bu Kitabı sənə nazil etdik. Kitab verdiyimiz şəxslər də ona iman gətirirlər. Onların arasında ona (Qurana) iman gətirənlər vardır. Bizim ayələrimizi ancaq kafirlər inkar edirlər. [ Ənkəbut 47]

**4. Rasulullahdan başqasının yolunun**, onun gətirdiyi yoldan daha yaxşı olduğuna, ya da Ondan başqasının hökmünün Onun hökmündən üstün olduğuna və ya tay olduğuna etiqad etmək küfrdür. Diliylə deməsə belə bu yollarla gedən, onlara tabe olan, bu yollara nifrət etməyənlər də eyni hökmə girər və kafir olar.

**5. Allahın kitabı və Rasulullahın sünnətindən hər hansı bir şeyə buğz edən**, qəzəblənən kəs, bununla əməl etsə belə yenə kafirdir.Bu ona görədir ki, onlar Allahın nazil etdiyinə nifrət etdilər, O da onların əməllərini puça çıxartdı.[ Muhammed, 9]

**6. Rasulullahın (s.ə.v) gətirdiyi** din ilə və ya Onun mükafat və cəza olaraq bildirdiyi şeylərlə istehza etmək küfrdür:"Onlardan nə üçün istehza etdiklərini soruşsan, deyərlər: “Biz sadəcə boş-boş danışıb zarafatlaşırdıq!” De: “Allaha, Onun ayələrinə və Onun Elçisinə istehzamı edirsiniz? Üzrxahlıq etməyin! İman gətirdikdən sonra artıq kafir oldunuz”.

Sizlərdən bir qismini bağışlasaq da, digərlərinə günahkar olduqlarına görə əzab verərik." [ Tövbə 65/66 ]

**7. Sehr və ya cadu etmək** və ya buna rıza göstərmək küfrdür :"Onlar Suleymanın səltənətində şeytanların oxuduqlarının ardınca getdilər. Süleyman kafir olmadı. Lakin şeytanlar sehri və Babildə Harut və Marut adlı iki mələyə nazil olanı insanlara öyrədərək kafir oldular. Mələklər: “Biz ancaq bir sınağıq, sən gəl kafir olma!”– deməmiş onu heç kəsə öyrətmirdilər. Yəhudilər ərlə arvadı bir-birindən ayıracaq işləri onlardan öyrənirdilər. Lakin onlar Allahın izni olmadan heç kəsə zərər verə bilməzlər. Onlar özlərinə zərər verən, faydası olmayan şeyləri öyrənirdilər. Onlar bilirdilər ki, onu əldə edən kimsə üçün axirətdə heç bir pay yoxdur. Nəfslərinin əvəzində satın aldıqları şey necə də pisdir! Kaş bunu biləydilər!" [ Baqara 102 ]

**8. Müsəlmanların əleyhinə kafirlərə yardım etmək**, onlara dəstək olmaq küfrdür: Ey iman gətirənlər! Yəhudi və xaçpərəstləri dost tutmayın! Onlar bir-birinin studurlar. Sizlərdən kim onları özünə dost tutarsa, o da onlardandır. Allah zalım adamları doğru yola yönəltməz.[ Maide, 51]

**9. Kim: "Xızır (ə.s) necə ki, Musanın (a.s) şəriətindən kənar hərəkət etməkdə sərbəst idisə**, bəziləri də Muhammədin (s.ə.v) şəriətindən çıxa bilər" kimi etiqad edərsə kafir olar.

**10. Öyrənməmək və onunla əməl etməməklə** Allahın dinindən üz çevirmək:"Rəbbinin ayələri yadına alındıqdan sonra onlardan üz döndərən kəsdən

daha zalım kim ola bilər? Şübhəsiz ki, Biz günahkarlardan intiqam alacağıq."[Səcdə 22]

**Təkfir barədə bilinməsi gərəkən**

**faydalı məlumatlar və qaydalar:**

Tərtib etdiyimiz bu yazılar İslamla yeni tanış olanlar və mənim kimi avam müsəlmanları maarifləndirmək məqsədi daşıdığı üçün burada sıralamaya və mümkün qədər yanlış anlamaların qarşısını almağa səy göstərmişik. Hər bir naqislikdən uzaq olan Allaha həmd olsun.

Qeyd etmək lazımdır ki, təkfir qaydaları İslamı yəqin olaraq sabit olan kəslərə tətbiq olunur. Əsli kafirlərə hər hansı bir qaydanın tətbiq olunması xatalara yol açacaqdır. Əhli sünnətə görə təkfir hökmləri 3 qismə bölünür:

1) Aslud-dinə(dinin əslinə) bağlı olan təkfir;  2) Əl Məlum minəd-dini bi-d-dərura (dindən bilinməsi vacib olan) ilə əlaqəli olan təkfir;  3) Əl Məsəilu Xəfiyyə (xəfi,gizli) ilə əlaqəli təkfir.

**1. Dinin əslinə bağlı olan məsələlərdə təkfirin şərtləri**, əngəlləri, maneələri və təvil kimi şeylərə baxılmaz. Yalnız bəzi ikrah, dil sürüşməsi və ağılın getməsi kimi səbəblərdə üzrlü sayılar. Bunların dəlilinə gəldikdə isə: " Qəlbi imanla sabit qaldığı halda haqqı danmağa məcbur edilən kəslər istisna olmaqla, kim iman gətirdikdən sonra Allahı inkar etsə və qəlbini küfrə açsa, Allahın qəzəbinə düçar olar. Onlar üçün böyük bir əzab vardır.[Nahl,106]. Həmçinin bu və ya digər bənzəri səbəblərə görə dil sürüşməsi səbəbiylə küfr sözü söyləyənin təkfir olunmamasının dəlili: Ənəs ibn Malik(r.a) Allah Rasulunun(s.ə.v) belə buyurduğunu söyləmişdir: "Allahın, bir qulunun Ona tovbə etməsinə sevinməsi: Birinizin quraq bir ərazidə dəvəsiylə olarkən, üzərində yemək və su olduğu halda dəvəsi qaçar.Dəvəsini tapmaqdan ümidini kəsib nəhayət bir ağacın kölgəsində yatar; dəvəsindən ümidini kəsmişdir. Elə bu halda ikən anidən dəvəsini başucunda durarkən görər. Dərhal dəvəsinin ipini tutar. Sonra sevincinin şiddəti səbəbiylə: Allahım! Sən mənim qulumsan, mən də sənin Rəbbinəm! deyərək sevincinin şiddətindən ötürü belə xəta etməsindəki sevincindən daha çoxdur."[Sahih-i Muslim 4932]

Həmçinin ağlın getməsinin təkfirə mane olmasının dəlili Allah Rasulunun bu hədisidir: Allah Rəsulu (sallallahu aleyhi və səlləm) demişdir: "Üç insandan qələm qaldırılmışdır (günahları yazılmır): Dəli ağıllanana qədər, yatan (yuxuda olan) oyanana (ayılana) qədər və uşaq həddi büluğa çatana qədər". (Hədis səhihdir. Səhihu-ll-Cəmi əs-Sağir: 3513.Bəs dinin əsli nədir? İslam dininin əsası, iki təməl qaydadan (fərzdən) ibarətdir.

-Birinci qayda: Allaha ibadətdə, Ona heç bir şeyi şərik qoşmadan ibadət etmək. Buna dəvətdə həris olmaq. Dostluğu (qardaşlığı) bunun üzərində qurmaq və bunu tərk edəni, təkfir etmək.

-İkinci qayda : Uca Allaha ibadətdə şərik qoşulmasından çəkindirmək. Bu məsələdə sərt və qətiyyətli olmaq. Bunun üçün düşmənçilik etmək. Və bunu (şirki) edənləri təkfir etmək. Və bunlara müxalif olanlar müxtəlifdirlər. Onların içərisində tövhidə ən şiddətli müxaliflik edənlər, məhz tövhidin tələblərini əhatə edən hər şeyə müxalif olanlardır.

-İnsanlardan elələri də var ki, tək olan Allaha ibadət edir. Lakin şirki inkar etmir və əhlinə qarşı da ədavət aparmır.

-İnsanlardan elələri də var ki, şirk əhlinə düşmənçilik etsələr də, onları təkfir etmirlər.

-Onlardan elələri də var ki, tövhidi sevmirlər, yalnız ona buğz da etmirlər.

-Onlardan elələri də var ki, muvahidləri təkfir edərlər vətövhidin saleh kesləri söymək olduğunu iddia edərlər.

-Onlardan elələri də var ki, şirki sevməsə də, ona heç buğz da etmir.

-Onlardan elələri də var ki, nə şirki bilir, nə də onu inkar edir.

-Onlardan elələri də var ki, nə tövhidi bilir, nə də onu inkar edir.-Onlardan elələri də var ki, özü tövhidə əməl etdiyi halda onun qədrini bilmir. Onu tərk edənə, nə buğz edir, nə də onu təkfir edir. Belələrinin halı ən şiddətli xüsranda olanların halıdır.

-Onlardan elələri də var ki, şirki tərk edir və ona nifrət edir. Lakin bunun qədrini bilmir. Bunların hamısı tövhidə müxaliflik edənlərdir.[ Əd-Duraru Səniyyə 2/22]. Həmçinin İmam İbn Teymiyyə belə deyir: "Tək olan Allah ibadət, dinin əslidir. Bu, Allahın rasullarını göndərib, kitablarını nazil etdiyi tövhiddir.Allahu təalə belə buyurur:"Səndən əvvəl göndərdiyimiz elçilərdən (onların davamçılarından) soruş; Biz Mərhəmətli Allahdan başqa ibadət ediləsi məbudlarmı icad etmişik?"[Zuxruf 45]. Böyük şirk və küfrdə cəhalətin üzrlü olmaması barədə olan babda bu məsələ təfsilatlandırılsada, qısaca mənbələr qeyd edəcəyik ki, ətraflı öyrənmək istəyənlər o mənbələrə müraciət etsinlər.Məsələylə bağlı alimlərin kitablarından mənbələr: [ Şeyx İshaq bin Abdurrahman əl-Hənbəli  Hukmu təkfiril-Muayyən səh:19; İmam alləmə Süleyman bin Səhman əl-Hənbəlinin əd-Diyau'ş-Şarik adlı kitabından; Təbdidu'z Zulam; Süleyman əl-Cəbhan səh:63]

**2. Əl Məlum minəd-dini bi-d-dərura yəni dindən bilinməsi zəruri olan məsələlərdə təkfir**, eynən birincidə olduğu kimidir. Burada da təvil, əngəl, maneə kimi şeylər üzrlü sayılmaz. Alimlə avam arasında fərq qoyulmaz. Məsələn: Kim namazın fərzliyini inkar edərsə kafir olar. Kim orucun fərzliyini inkar edərsə kafir olar. Və ya faizi halal görərsə kafir olar. Burada əhli sünnə alimləri birincidən fərlqli olaraq iki istisna gətirir:a) İslama yeni girən kimsə; b) Müsəlmanlardan uzaq bölgədə yaşayan kəs olarsa, soruşma imkanı,öyrənmə imkanı olmadığından dolayı üzrlü sayılar. Bu məsələ barədə İbn Teymiyyə rahimahullah buyurur: "Cahil o kəsdir ki, cahilliyi özündən dəf etməyə imkanı olmayan  kəsdir və cəhalət onun üçün keçərlidir. Əks halda müsəlmanların arasında yaşayan, öyrənmə imkanı olan və ya uzun müddət islamda olan kəs üçün bu cəhalət keçərli deyil. Çünki bu kəs üz çevirmişdir və öyrənməmişdir."  İmam Suyuti belə deyir:"Elmində insanların çoxunun müştərək olduğu haramlarda cahil olan kəsin üzrü qəbul edilməz. Ancaq yeni islama girən və ya alimlərdən uzaq bölgələrdə yetişən kəslər bundan istisna edilirlər. Buna misal: içkinin haramlığı, namazda danışmaq, orucu yemək, bir kəsin cinayət etdiyinə dair şahidlik edən kəsin, o şəxsin öldürüldüyündən sonra şahid şahidliyindən dönüb digər şahidlə birlikdə:"Biz yalan dedik. Bu adamın bizim şahidliyimizlə öldürüləcəyini zənn etmirdik" iddiaları qəbul edilməz. Çünki bu cür məsələlər insanların avamına qapalı deyildir." [Suyuti; Əl-Əşbah vən-nəzəir]. Daha ətraflı baxmaq üçün mənbə: [ Şərhu Muslim, İmam Nəvəvi 1/205; Əl-Məvsuatu'l-

fıqhiyyə 16/200; Əl-Mənsur fi'l qavaid; Zərkaşi 2/15-16; Kitabu'l-Qavaid, Takiyyuddin əl-Həsəni əş-Şafii 2/268; Şeyx Muhammməd Rəşid Rızanın Bəyanul-Əzhar adlı kitaba etdiyi əlavə.]

**3) Əl Məsəilul Xəfiyyə. Bunlar alimlərin bildiyi, lakin avamın bilməsi vacib olmayan, bilməsə belə onun üçün üzürlü olan, fərz olmayan məsələlərdir**. Məsələn, miras bölgüsü, vəsiyyət, kəbin və s. kimi elm əhlinin bildiyi, avama isə bilməsi fərz olmayan məsələlərdir. Və ya bəzi ad və sifətlərdə bidət əhlinin təvil etməsi kimi (əsli pozmayan məsələlərdə) hallarda şübhəyə düşənə alimlər təkfirin şərtlərini, maneələrini, əngəllərini və şübhələrinin,təvilinin aradan qaldırılmasını şərt qoşublar. Burada dinə yeni girənlə köhnə arasında fərq qoyulmur. Xəfi məsələlərlə əlaqəli Əhli sünnət ilə digərlərini ayıran fərq budur: İstiva, Uluv və ru'yət kimi məsələlər xəfi məsələlər olsada, Rububiyyətə daxil olan Qüdrət və Elm kimi sifətlər açıq olan məsələlərdəndir. Rububiyyətlə əlaqəli sifətlərdə cahil olan kəsin üzrlü olmayacağına dair Qarafinin "Əl-Furuk" adlı kitabına baxa bilərsiniz. Bu barədə Şeyxul-İslam İbn Teymiyyə belə deyir: "Bu məsələ araşdırıldığı zaman görüləcək ki, bəzi sözlər küfr ola bilər. Məsələn Allahın danışmayacağını deyən və ya axirətdə görməyəcəyimizi iddia edən Cəhmiyyələr kimi. Ancaq bəzi insanlara bunun küfr olması qapalı ola bilər. Ümumi mənada bu sözü deyənin küfrü açıqlanır. Sələfin: "Quran məxluqdur deyən kafir olmuşdur, Allah axirət günü görülməyəcəkdir deyən kafir olmuşdur" sözlərində olduğu kimi. Daha əvvəl də keçdiyi kimi müəyyən şəxs hüccət iqamə edilənə qədər təkfir edilməz."[El-İmanu’l-Avsat s.161]

Günümüzün cəhmiyyələri bu məsələləri qarışdırdıqlarına görə küfrə düşmüşlər.Xəfi məsələlərə aid olan şərtləri, dinin əslini yerinə gətirməmiş olan əsli kafirlərə tətbiq edirlər. Hətta bu kafirləri,müşrikləri və onlardan daha zalım olan tağutları müdafiə etmək, onlara islam donu geyindirmək üçün müsəlmanlara düşmənçilik edir, tövhid əhlinə təkfirçi və xavaric damğası vururlar. Və yaxud da mötəzilə firqəsi, xəfi olan məsələlərdə də dinin əslindəki qaydaları tətbiq edərək müsəlmanları təkfir etdilər. Beləliklə, bütün bunlar usuldan sapmaları və səhv tətbiq etmələri səbəbiylə meydana gəldi. Sapmaqdan, sapdırılmaqdan və sapdırmaqdan Allaha sığınırıq. Xəfi məsələlər barədə təfsilata baxmaq üçün mənbə: [ Məcməu fətava 4/54; Duraru səniyyə s:357; Şihabuddin əl-Qarafinin Əl-

Furuk kitabı 2/146-163; Şeyx Muhammməd Rəşid Rızanın Bəyanul-Əzhar adlı kitaba etdiyi əlavə; İbni Teymiyyə Şərhi'l Umdə; İmam əbu Battin əl-İntisar; Əl-İmanu'l-Avsat ]

Bir digər məsələ də zəlalət əhlinin "hüccətdən qabaq təkfir edilməz" şübhəsidir. İddia edirlər ki, insan şirk və ya küfr etsə belə hüccətdən əvvəl təkfir edilməz. Buna səbəb ya İsim və hökm məsələsinin bir-birindən fərqləndiyini bilməmələri, ya da nəfslərinə və havalarına uyğun danışaraq tağutları razı salmağa çalışmalarıdır. İndi isə dəlillərə əsasən baxaq məsələnin əsli necədir. “İsimlə hökmün hüccətdən qabaq ayrilması və hüccətdən sonra isə cəm olması” barədə bir çox alimlər əhli sünnətin böyük qaydalarından olduğunu zikir edərək buyurmuşlar; Allah Əzzə və Cəllə Öz kitabında isimlə hökmümü risalənin gəlməsindən öncə ayırmış, risalənin gəlişindən sonra isə onları cəm etmişdir. Və hüccətin çatmaması ilə, şəriətdəki şirk, küfr və fasiqlik kimi isimləri dəyişməmişdir. O əməlləri edənlərə hüccətin və dəvətin çatmaması səbəbi ilə əzab edilməsə də, rəsullar gəlməmişdən qabaq belə, müşrik kimi isimlər verilmişdir. Rəbbinə şərik qoşanlara və onu başqalarına tay tutanlara, həmişə isim olaraq kafir və müşrik isimləri verilmişdir. Və alimlər hər kəsə dinin isimlərindən olan islam, iman, küfr, nifaq, riddə, yəhudi, nəsrani və s kimi isimlərlə vəsflənənlərə, bu isimlərə uyğun hökmlər çıxarmışlar. Bu müsəlman, kafir və müşrik və digər bunun kimi isimlərə aiddir. Çünki, Allah Musanı , Fironun yanına göndərərkən buyurur: “Fironun yanına get həqiqətən də o həddini asıb.” Və onu, həddini aşan (tağut) adlandırır. Baxmayaraq ki, Musa hələ onun yanına getməmişdi və risaləti (hüccəti) ona çatdırmamışdı. Və həmçinin Süleymanın məktubu hələ Bulqeyzə çatmamış onu və qövmünü, onlarda zahir olan küfr və şirkə görə, Allah quranda kafir adlandırmışdır. “Həqiqətən də onlar kafir bir qövmdürlər” Şəriətdəki isimlər, hökmlərin tətbiq olub, olmamasından asılı olmayaraq verilir. Yəni oğrunun əlini kəsməsələr də, onun adı oğru olaraq qalır. Bu cür də müşrik, kafir və digər hökmlərə də isimlər verilir. əhli Bu və bunun kimi əhli sünnət qaydalarını tarix boyu, bidət və zəlalət inkar edərək, əhli sünnətə müxtəlif adlar verərək(xəvaric, zahiri, mucassimə) qarşı gəlmişlər. Ancaq necə ki Rəsulullah buyurub; “onlara (qəriblərə) müxalif olanlar, onlara heç bir şeylə zərər verə bilməyəcəklər.”

İbn Qeyyim rahimahullah buyurur: Allahdan başqasına ibadət edən şəxs müşrikdir və müəyyən olaraq bu isimlə isimləndirilir, hətta o şəxsə hüccət(Risalət hüccəti) çatmayıbsa belə müşrik ismi ilə isimləndirilir və mümkün deyil ki, bu şəxs müsəlman ismi ilə isimləndirilsin. Çünki İslam, tək və şəriki olmayan Allaha ibadət etməkdir, Ona heç bir şərik qoşmamaqdır, Allaha və Rasuluna iman etməkdir, Rasulunun Allah qatından təbliğ etdiyi hər bir şeyə iman etməkdir. Bir insan bunları bilib əməl etməyincə müsəlman olmaz. Əgər bu insan inadkar kafir deyilsədə cahil kafirdir.[Tariqul Hicrəteyn s. 411]

"Qul, istər itaət etsin, istərsə itaət etməsin Allahın hüccətinin özünə iqamə edildiyini etiraf etməsi imanın gərəktirdiyi bir şeydir. Çünki Allah o qula rasul göndərdiyi və kitab nazil etdiyi zaman, hüccətin ona çatma imkanı varsa bu halda ona hüccət iqamə edilmiş sayılır. Bu xüsusda elm sahibi və ya cahil olması əhəmiyyətli deyil. Beləki hərkim, hüccətə çatma imkanı olduğu halda Allahın əmr və qadağalarını səhlənkarlığı səbəbiylə öyrənməyibsə ona huccət iqamə edilmiş sayılır. [ Mədəricuz Salikin 1-ci cild səh.239]

Həmçinin yenə İbn Qeyyim rahimahullah buyurur:"Həqiqətən,Allah öz huccətini məxluqatların üzərində Quran və öz Rasulları vasitəsilə çatdırdı. Allah buyurur:"Aləmləri xəbərdar etməsindən ötrü Öz quluna

Furqanı(Quranı) nazil edən(Allah) necə də xeyirxahdır!"[Furqan 1]

Və başqa ayədə buyurur: "Bu Quran mənə vəhy olundu ki, onunla sizi və onun çatacağı hərkəsi xəbərdar edim." [Ənam 19]. Və hərkəs ki, kimə Quran çatıb, o xəbərdar olunub, və onun üzərində Allahın hüccəti çatıb". [Əs-Səvəik əl-Mursalə" 2/735]

İbn Teymiyyə dedi ki: "Müşrik ismi hüccət iqaməsindən əvvəl sabit olur. Çünki o şirk etmiş Rəbbinə ortaqlar qoşmuşdur. Ancaq əzablandırmaq isə risalət huccətindən əvvəl olmaz.[Məcmuətul Fətəva 20/37]

Şeyxul İsləm Muhamməd bin AbdulVahhab rahimahullah demişdir: "Həqiqətən kafirlərin əksəriyyəti üzərlərinə hüccət iqamə edilməsinə baxmayaraq Allahın hüccətini anlamamışlardır. Necə ki Allah Təalə buyurur: "Yoxsa elə hesab edirsən

ki, onların əksəriyyəti eşidəcək və anlayacaq? Onlar heyvan kimidirlər, hətta haqq yoldan daha çox uzaqlaşmışlar."[Furqan 44] [Tarixul-Nəcd]

## BÖYÜK ŞİRKDƏ VƏ AÇIQ KÜFRDƏ CƏHALƏT ÜZRDÜRMÜ ?

Bizləri cahiliyyənin bataqlığından və qaranlığından hidayət nuruna çıxaran Allaha həmd olsun. Allahın izni və yardımı ilə bu qısa yazıda usula əsaslanaraq, müşriklərin və kafirlərin müdafiəçisi olan bəzi zəlalət əhlinin şübhələrini ifşa edəcəyik. Əhli Sünnə vəl Camaat böyük şirkdə və açıq küfrdə cahilliyin üzr olmamasını 5 şeylə isbat edir. Yer üzərinə gəlmiş hər insanın üzərində Allah Əzzə və Cəllənin beş dəlili var. Bu beş dəlilin hər biri müstəqildir. Yəni müstəqil olduqları üçün ağıl xaric digər hər hansı birinin olmaması bizi Allah yanında üzürlü etməz. Qeyd edəcəyimiz bu 5 dəlilin ilk üçü hər sağlam insanda mövcuddur.

**1. DƏLİL: MİSAQ** (yəni verilən söz). Misaq dəlili biz hələ dünyaya gəlməzdən əvvəl Uca Allaha verdiyimiz sözdür: "Bir zaman Rəbbin Adəm oğullarının bellərindən onların törəmələrini çıxarmış və: “Mən sizin Rəbbiniz deyiləmmi?”– deyə onları özlərinin əleyhinə şahid tutmuşdu. Onlar: “Bəli, biz şahid olduq!”– demişdilər. Bu ona görədir ki, siz Qiyamət günü: “Biz bundan xəbərsiz idik!”– deməyəsiniz. Yaxud: “Atalarımız bizdən əvvəl Allaha şərik qoşmuş, biz də onlardan sonra gələn bir nəsil olmuşuq. Məgər Sən bizi batilə uyanların etdikləri əməllərə görə məhv edəcəksən?”– deməyəsiniz. [ Araf 172-173 ]

**2. DƏLİL: FİTRƏT** Sən bir hənif kimi üzünü dinə tərəf çevir! Allahın insanlara – xəlq etdiyi şüurlu məxluq kimi verdiyi fitrət budur. Allahın yaratdığını heç cür dəyişdirmək olmaz. Doğru din budur, lakin insanların çoxu bunu bilmir. [ Rum, 30 ]

Əsmə bintu Əbu Bəkr -radiyallahu anhə- demişdir:"Zeyd bin Amr bin Nufeylin ayaq üstə dayanıb belini Kəbəyə dayayaraq belə dediyini eşitdim: "Ey Qureyş xalqı! Vallahi məndən başqa heç biriniz İbrahimin dini üzərində deyilsiniz!" [Sahihul-Buxari 5/41, nömrə: 3828]Görəsən günümüzdəki bəzi zındıqlara görə İbrahimin hənif dini üzərə olan muvahhid Zeyd bin Amr bin Nufeyldə xavaric və mötəzilədir?!

Çünki o səlim bir fitrətin gərəyi olaraq öz şirk üzərində olan müşrik qövmünü təkfir etmişdir. Hansı ki ona nə rəsul Muhamməd -sallallahu aleyhi və səlləm-gəlmişdi,nə də ki Quran. Ancaq atasının adı Abdullah olan və göndərilmiş son Tövhid dəvətçisi olan Muhamməd -sallallahu aleyhi və səlləm- isə bu zındıqlara görə öz qövmünü risalətdən öncə təkfir etməmişdir. Hətta kim deyərsə ki, Rəsulullah risalətdən öncə öz şirk əhli olan qövmünü təkfir etmişdir o ya xavaric olur ya da ki mötəzilə(!) Sizə nə olub, necə hökm verirsiniz?  [Qaləm: 36]

**3. DƏLİL: AĞIL:** Allahın ağıl nemətini bəxş etdiyi kəs bu ağılla Allahın tövhidini dərk edər və Yaradanın bir şərikinin olmasının ağıla da zidd olduğunu anlayar. " Əgər göydə və yerdə Allahdan başqa məbudlar olsaydı onların hər ikisi fəsada uğrayardı...[Ənbiyə 22 ]

Allah Özünə heç bir övlad götürməmişdir. Onunla yanaşı ibadətə layiq olan heç bir məbud yoxdur. Əks təqdirdə hər bir məbud öz yaratdıqlarını özü idarə etmək istəyər və onların bir qismi digərinə üstün gəlməyə can atardı. Allah onların Ona aid etdikləri sifətlərdən uzaqdır.[ Mu'minûn, 91]

**4. DƏLİL: RASULLAR**

"Biz müjdə verən və qorxudan elçilər göndərdik ki, insanların elçilərdən sonra bir bəhanəsi olmasın. Allah Qüdrətlidir, Müdrikdir." [ Nisa 165 ]

**5. DƏLİL: QURANİ KƏRİM**

De: “Kimin şahidliyi daha böyükdür?” De: “Allah mənimlə sizin aranızda Şahiddir. Bu Quran mənə vəhy olundu ki, onunla sizi və onun çatacağı hər kəsi xəbərdar edim. Məgər siz Allahla yanaşı ibadətə layiq olan başqa budların olduğuna şahidlik edirsiniz?” De: “Mən şahidlik etmirəm!” De: “O, Tək olan İlahdır. Mən sizin şərik qoşduqlarınızdan uzağam”. [ Ənam 19]

Bir zaman Rəbbin Adəm oğullarının bellərindən onların törəmələrini çıxarmış və: “Mən sizin Rəbbiniz deyiləmmi?”– deyə onları özlərinin əleyhinə şahid tutmuşdu. Onlar: “Bəli, biz şahid olduq!”– demişdilər. Bu ona görədir ki, siz Qiyamət günü: “Biz bundan xəbərsiz idik!”– deməyəsiniz. Yaxud: “Atalarımız bizdən əvvəl Allaha şərik qoşmuş, biz də onlardan sonra gələn bir nəsil olmuşuq. Məgər Sən bizi batilə

uyanların etdikləri əməllərə görə məhv edəcəksən?”– deməyəsiniz. [ Araf 172-173 ]

Misaq ayələri adlanan bu ayələrdə Allahu təalə insan övladının dünyada ikən Allaha şirk qoşduğu əməllərdə cahil olmalarının onlar üçün qiyamət günü üzr sayılmayacağını açıq şəkildə bildirmişdir. Burada Uca Rabbimiz nə onların qafil və ya cahil olmalarını, nə də öz atalarını təqlid etmələrini üzr olaraq qəbul etməmişdir. Bununla yanaşı qullarına qarşı çox mərhəmətli olan Allah Əzzə və Cəllə zaman-zaman peyğəmbərlər göndərərək onlara xəbərdarlıq etmişdir."Biz elçiləri müjdələyici və qorxuducu olaraq göndərdik ki, insanların elçilərdən sonra bir bəhanəsi qalmasın. Allah Əzizdir Və Hikmət sahibidir!" [ Nisa 165 ]

Artıq peyğəmbərlərdən sonra heç kəsin bir üzürü yoxdur. Peyğəmbərlərin göndərilmə məqsədinə gəlincə: "And olsun biz hər ümmətə Allaha ibadət edin, tağutdan çəkinin deyə elçi göndərdik" [Nəhl 36 ]

Rahim və Rauf olan Allah Qurani Kərimdə bütün peyğəmbərlərin qövmlərini "cahillər" olaraq vəsf etmişdir. Onların etdikləri əməlləri də cahillik adlandırmışdır. Ancaq buna baxmayaraq onların dinin əslindəki cəhalətlərini üzrlü saymamışdır. Baxın Nuh əleyhisələm öz qövmünə nə deyir: "Ey qövmüm! Mən buna görə sizdən var-dövlət istəmirəm. Mənim mükafatım ancaq Allaha aiddir. Mən iman gətirənləri qovan deyiləm. Çünki onlar Rəbbi ilə qarşılaşacaqlar. Lakin mən sizin cahil adamlar olduğunuzu görürəm."[ Hûd, 29]

Saleh əleyhisələmin qövmü haqqında:"De ki: "Onun elmi yalnız Allah qatındadı və mən göndərildiyim şeyi sizə təbliğ edirəm. Lakin mən sizin cahillik edən bir qövm olduğunuzu görürəm." [ Əhqaf 23 ]

Lutun (ə.s) qövmü haqqında:"(Lut dedi) "Siz həqiqətən də qadınları qoyub, şəhvətlə kişilərəmi gedəcəksiniz? Xeyr! Siz cahillik edən bir qövmsünüz" [ Nəml 55 ]

Şuaybın (ə.s) qövmü barədə:"Dedilər ki: "Ey Şuayb! Biz sənin dediklərinin çoxunu anlamırıq. Həqiqətən də biz səni içimizdə zəif bir kimsə olaraq görürük. Əgər sənin aşirətin olmasaydı, səni rəcm edərdik. Və sən bizim yanımızda əziz birisi də deyilsən." [ Hud 91 ]

Diqqət edin! Onların Şuayb əleyhissələmi anlamaması, haqqı fəhm etməmələri Allah qatında üzrlü sayılmadı: "Əzab əmrimiz gəldiyi zaman Şuaybı və onunla birlikdə iman edənləri Öz tərəfimizdən bir rəhmət ilə qurtardıq. Zülm edənləri isə qorxunc bir səs bürüdü və öz yurdlarında diz üstə çöküb qaldılar." [ Hud 94 ]

Allah şirkin bütün əməlləri yox etdiyini bildirmiş və onu heç vaxt bağışlamayacağına hökm vermişdir: De: "Mənə Allahdan qeyrisinəmi ibadət etməyi əmr edirsiniz, ey cahillər?" Sənə və səndən əvvəlkilərə belə vəhy olunmuşdur: "Əgər şərik qoşsan, əməlin puç olacaq və mütləq ziyana uğrayanlardan olacaqsan. [ Zumər,64- 65 ]

"Şübhəsiz ki, Allah Özünə şərik qoşulmasını bağışlamaz, bundan başqa daha kiçik günahları isə istədiyi kimsəyə bağışlayar..."[ Nisâ, 48]

Peyğəmbər s.ə.v buyrmuşdur:"Kim Allaha heç bir şeyi şərik qoşmada ölərsə cənnətə girər. Kim də Allaha şərik qoşduğu halda ölərsə cəhənnəmə girər. "[Səhihu Muslim93]

Ağıl sahibləri üçün bu qədər dəlil kifayətdir. Lakin zəlalət əhlinin "sələf bu cür fəhm etməyib" iftirasına cavab olaraq sələfdən bəzilərinin dediklərini nəzərinizə çatdıracam.

Qadı Əl-İyad dedi: "Heçkim küfr etdiyinə görə cəhaləti səbəbiylə üzrlü deyil." [ Əş-Şifə 2/201]

İmam Şafi rahimahullah belə dedi:"Əgər cahil cəhalətindən dolayı üzrlü olmuş olsaydı, cəhalət elmdən daha xeyirli olardı." [ Əl-Mənsur fil-qavaidi'l-fiqhiyyə 2/16-17 ]

İmam Qarafi dedi: "İcma ilə sabit olduğuna görə Allahu Təalə usulud-dindəki(dinin əslindəki) cəhaləti üzürlü olaraq saymamışdır." [ Qarafi, Şərhu Tənqihi'l-Fusul 439 ]

Nəcd alimlərindən Şeyx Əbu Buteyn dedi:"Kim deyir ki, küfr edən səhv içtihadına görə və ya təqlidə, və ya cahilliyinə görə üzürlüdür. Heç şübhəsiz ki o, Quran, Sünnə İcmaya ziddiyətdədir! [ Əl- İntisar-li hizbi Llyahi əl-muvahhidin" 1-37 ]

Şeyx Abdurrahman bin Hasan belə dedi:"Səhabələr, tabein, sələfi saleh və əhli sünnət alimlərinin hamısı bir kimsənin şirki tərk etmədən, ondan uzaq durmadan müsəlman olmayacağı mövzusunda icma etmişlərdir."[Əd-Duraru's-Səniyyə11/545-546]

İbnul Qayyim rahimahullah:"İslam, Allahı təkləşdirib heçbir şeyi ona ortaq qoşmadan yalnız Ona ibadət edərək, Allaha, Rasuluna iman etmək, rasulun gətirdiklərinə tabe olmaqdır. Qul bunu etməzsə müsəlman deyildir. İnadçı

Bir Kafir deyilsədə Cahil bir kafirdir."[TariqulHicrəteyn 1/411 ]

Buradaki isimlərin sayını daha da artırmaq olar. Lakin bunlarla kifayətlənirik. Allah cahil müşriklərə hidayət versin ! AMİN

## BÖYÜK ŞİRK EDƏN MÜŞRİKLƏRƏ CAHİLLİYİ ÜZR GƏTİRƏRƏK ONLARI TƏKFİR ETMƏYƏNLƏRİN(AZİRİN) TƏKFİR EDİLMƏ SƏBƏBLƏRİ:

1.Tağutu inkar etməmək

2. Dinin əslini yerinə gətirməmək

3. Dinin əsliylə bağlı olan qəti icmanı rədd etmək

4. Quranın xəbərini rədd edərək onu təsdiq etməmək

5. Dində bilinməsi zəruri olan şeyi yalan sayaraq inkar etmək.

**1)Tağutu inkar etməmək:** müşriklərin təkfiri tağutu inkara daxildir. Bunun Qurandan dəlili Mumtəhinə surəsi 4-cü ayədir:"İbrahim və onunla birlikdə olanlarda sizin üçün gözəl bir nümunə vardır. Onlar öz qövmünə dedilər: “Həqiqətən, biz sizdən və sizin Allahdan başqa tapındığınız şeylərdən uzağıq. Biz sizi inkar/təkfir edirik. Siz bir olan Allaha iman gətirincəyə qədər bizimlə sizin

aranızda daim ədavət və nifrət olacaqdır!” Yalnız İbrahimin öz atasına: “Mən sənin üçün mütləq bağışlanma diləyəcəyəm. Fəqət Allahdan sənə gələn əzabı dəf edə bilmərəm!”– deməsi istisnadır. Onlar dedilər: “Ey Rəbbimiz! Biz yalnız Sənə təvəkkül edir və yalnız Sənə üz tuturuq.Dönüş də yalnız Sənədir"[Mumtəhinə 4]

Burada bir neçə yöndən təkfir var. Birinci yönü bu ayədəki təbərri olmaq mütləq şəkildədir. Mütləq şəkildə təbərri isə bir müsəlmana edilməz, kafirə və müşrikə edilər. Bir başqa yönü isə: "siz bir olan Allaha iman edincəyə qədər..." deməli bu şəxslər müşrik və kafirdirlər ki, onlara belə bir şərt qoyulur. Dilçi alimlər ayətdəki "kəfərnə bikum" haqqında belə deyirlər. Burada "kəfərnə" feli "bi" hərfu cəri ilə işlədildikdə təkfir mənasında işlədilir. Şeyxul İslam ibn Teymiyyə rahimahullah:"Həqiqətən əhlul-miləl(yəhidi və xristiyanlar) belə ittifaq etmişdir ki, bütün rasullar bütlərə ibadəti qadağan edib və bunu edənləri təkfir etmək üzərə icma etmişlərdir. Mömin bütlərə ibadət etməkdən və Allahdan başqa bütün məbudlardan təbərri etməyincə əsla mömin ola bilməz. Necəki Allah Təalə buyurur:" ...Həqiqətən biz sizdən və sizin Allahdan başqa ibadət etdiklərinizdən uzağıq. Biz sizi inkar/təkfir edirik.Siz bir olan Allaha iman gətirincəyə qədər bizimlə sizin aranızda daim ədavət və nifrət olacaqdır!"[Məcməul-Fətava 2/128]

Yəni yəhudilər, xristiyanlar və kitab nazil edilmiş dinlər, böyük şirk edənin təkfirində icma etmişlər. Həmçinin şeyxul İslam ibn Teymiyyə də Mumtəhinə 4-ü təkfir anlamında dəlil olaraq gətirmişdir.

**2) Dinin əslini yerinə gətirməmək.** Müşriklərin təkfiri dinin əslindəndir. Şeyx ət-Təmiminin "İslam dininin əsli olan iki qayda" risaləsində belə buyurur:

"İslam dininin əsli və qaydası bu ikisidir:"

a) Heçbir ortağı olmayan bir və tək olan Allaha ibadət etməyi əmr etmək, buna dəvət etmək, bunun uğrunda dostluq etmək və onu tərk edəni təkfir etmək.

b) Allaha ibadətdə şərik qoşulmasından çəkindirmək. Bu məsələdə sərt və qətiyyətli olmaq. Bunun üçün düşmənçilik etmək və şirki edənləri təkfir etmək. [ Əd-Durarus-Səniyyə 2/22 ]

**3) Dinin əsli ilə bağlı olan qəti icmanı rədd etmək:** Böyük şirkdə cahillik Quran, Sünnə və İcma ilə üzrlü deyildir: Şihəbud-Din Qarafi əl-Məliki demişdir: "Allah dinin əsillərində icma ilə cahilliyi üzr saymamışdır." [ Şərhu-Tənhiqul-Fusul səh:439 ]

Nəcd diyarının müftisi olmuş şeyx Əbə Buteyn rahimahullah demişdir: "Küfr edən şəxsin təvil edərək və ya təqlid edərək və yaxud da cahillik səbəbilə üzürlü olduğunu iddia edən şəxs, heç şübhəsiz ki, Kitaba, sünnətə və icmaya müxalif olmuşdur." [ Əd-Durarus- Səniyyə 12/72-73 ]

Dinin əsliylə bağlı icmanı rədd edən kəs isə şübhəsiz ki təkfir edilir. İbn Teymiyyə rahimahullah icmaya müxalif olmaq barədə təfsilatı izah edərək demişdir: "Məlum olan icmaya müxalif olan kimsə təkfir edilir. Necə ki, nassı tərk etməklə ona müxalif olanın təkfir edildiyi kimi. Ancaq bu hökm nass ilə sabit olduğu bəlli olan icmaya müxalif olana aiddir. Lakin sübutu nass ilə bilinməyən icmaya gəldikdə isə bu bilinmir və onun təkfirindən imtina edilir. Nass ilə bərabər olan icma, eynən Kitab və sünnət kimi dəlildir." [ Məcməul Fətəva 19/270 ]

**4) Quranın xəbərini rədd edərək onu təsdiq etməmək:** Böyük şirk edən müşrikləri təkfir etməyən şəxs Allahın Quranda şirk edənləri təkfir etməsi haqda olan ayələri rədd və inkar etmiş sayılır. Buna isə şəriətdə "təkzibun-nas" deyilir. Şirk edənin təkfiri barədə Allah Əzzə və Cəllə buyurur: "...insanları Allahın yolundan çıxartmaq məqsədilə Ona şəriklər qoşur. De:"Küfrünlə bu dünyada bir az dolan. Şübhəsiz ki, sən cəhənnəm sakinlərindənsən!" [ Zumər 8 ]

Quran ayələrini inkar etməyin, yalanlamağın küfr olması haqqında isə Uca Allah buyurur: "Allaha qarşı yalan uyduran və həqiqət ona bəyan edildikdə onu yalan sayan kimsədən daha zalım kim ola bilər? Məgər cəhənnəmdə kafirlər üçün yer yoxdurmu?" [ Zumər 32 ]

Bu haqda Şəmsud-din İbn Qudamə əl-Maqdisi əl-Hənbəli demişdir: "Qurandan bir surəni və ya ayəni və ya kəliməni, və ya bir hərfi inkar edən kəsin ittifaqla kafir olmasında müsəlmanlar arasında ixtilaf yoxdur."[ Lumətul- İtiqaad səh:21 ]

**5) Dində bilinməsi zəruri olan şeyi yalan sayaraq onu inkar etmək:** Böyük şirk edən müşrikləri təkfir etmək İslam dinində bilinməsi zəruri olan məsələlərdəndir.

Bu səbəblə hər kim müşrikləri təkfir etməzsə İslam dinində zəruri olaraq bilinən bir məsələni inkar etdiyi üçün küfr etmiş olar. Bu məsələ barədə İbn Teymiyyə rahimahullah belə demişdir: "Bu dindən zəruri olaraq bilinir ki, Allah rasulları müşriklərin ibadət etdiklərini, Allahdan başqası hesab edirdilər. Şərik qoşduqları o batil ilahlara ibadət edəni, Allahdan başqasına ibadət edən , Allaha şərik qoşan müşrik, onu Allaha bərabər tutan və Allaha tay tutan hesab edirdilər. Rasullar məxluqatı tək olan, heçbir şəriki olmayan Allaha ibadət etməyə çağırırdılar. Məhz bu Allahın dinidir. Hansı ki, Allah təalə kitablarını bu din üzərinə nazil etmiş və rasullarını bu din ilə göndərmişdir. Bu din ümumi olan İslamdır ki, Allah nə əvvəlkilərdən  nə də sonrakilərdən ondan başqasını qəbul etməz." [Məcmuul-Fətəva 2/255-256]

Rahimahullah başqa bir yerdə isə belə demişdir: "Həqiqətən müsəlmanlar İslam dinindən zəruri olaraq bilinən elm üzərinə ittifaq etmişlər ki, qulun Allahdan başqasına ibadət etməsi, dua etməsi, yardım istəməsi və təvəkkül etməsi caiz deyildir. Kim bir yaxınlaşdırılmış mələyə və ya göndərilmiş bir nəbiyə dua edər və ya ondan yardım istəyərsə o müşrikdir." [Məcməul Fətəva 3/272 ]

Bu haqda həmçinin Şeyx Süleyman bin Abdullah bin Şeyxul-İsləm Muhamməd bin Abdulvahhab rahimahullah- 4 məzhəb alimlərinin böyük şirk edəni təkfir etməsi haqqında görüşlərini gətirdikdən sonra demişdir: " Bu səhih bir icmadır. Dindən zəruri olaraq bilinən bir məsələdir. Dörd məzhəbin alimləri və həmçinin digərləri "mürtədin hökmü ilə əlaqəli babda" Allaha şərik qoşan və ibadət növlərindən hər hansı birini Allah ilə bərabər başqasına yönəldərək ibadət edən kəsin kafir olacağını qeyd etmişlərdir." [ "Təysirul- Əzizul-Həmid" səh:427 ]

## DARUL İSLAM VƏ DARUL KÜFÜR

Ümumi məlumat: Dar- lüğətdə şəhər, bəldə, vətən və ölkə mənalarına gəlir. Qurani Kərimdə sadəcə ölkə olaraq deyil cənnət, cəhənnəm, axirət yurdu və ya peyğəmbər şəhəri Mədinə kimi mənalarda da işlənmişdir. Dar məsələsini açıqlayan qaydalar: 1.Qayda: Quran və Sünnət bəldələri bir birindən ayırmışdır. Allah subhanəhu və təalənin Quranda toplumları və bəldələri bir-birindən

ayırdığının bəzi dəlilləri bunlardır: "Kafir olanlar öz elçilərinə dedilər: "Sizi ya öz torpaqlarımızdan qovacağıq, ya da mütləq dinimizə qayıdacaqsınız!..[ İbrahim13]

Burada kafirlər torpağı özlərinə izafə edirlər. Yenə Allah subhanəhu və təalə peyğəmbərlər üzərindən misal göstərir: "Onun qövmünün təkəbbürlü zadəganları dedilər: "Ey Şueyb! Ya biz hökmən səni də, səninlə birlikdə iman gətirənləri də yurdumuzdan çıxardacağıq. Ya da siz bizim dinimizə dönəcəksiniz." [ Araf 88 ]
Diqqət etsək görərik ki, eynilə bu ayətdə də kafirlər bəldənin özlərinə aid olduğunu bildirirlər. Elə isə torpaqlar "kafirlərə aid olan və müsəlmanlara aid olan" olmaqla iki qismə ayrılır. Eyni şəkildə Peyğəmbər və onun əshabı da bu nasları elə bu cür fəhm etmiş və ölkələri iki qismə ayırmışlar: "Peyğəmbər s.ə.v bir hədisdə belə buyurur: "Sən düşmənlə qarşılaşdığın zaman onları 3 şeyə çağır. İlk olaraq İslama dəvət et. Qəbul etməsələr cizyəyə çağır. Bunuda qəbul etməsələr bu halda onlarla savaş. Əgər İslamı dəvət etsələr onları öz darlarından mühacir olanların darına dəvət et." [ İmam Muslim ]

Burada peyğəmbər s.ə.v məsələyə sadəcə torpaq parçası olaraq deyil, əksinə müşriklərin və mühacirlərin darı olaraq baxır.Yenə Əbu Hureyranın (r.a) hicrət edişini rəvayət edərkən belə demişdir: "Nəbinin yanına gələrkən belə dedim: Nə uzun nə yorucu bir gecə idi. Lakin məni küfr diyarından qurtardı. Səfər əsnasında köləm qaçmışdı. Gəlib Nəbiyə beyət etdim.Hələ yanından ayrılmamış köləm çıxıb gəldi. Rasulullah belə dedi: "Ey Əbu Hureyra bu sənin köləndirmi?" Mən: "Allah üçün azaddır dedim və azad etdim." [ Buxari ]

Səhabə içindən çıxdığı darın kafirlərin darı olduğunu bildirir. Abdurrahman bin Auf (r.a) həcc günündə Ömərə (r.a) belə deyir:"Dərhal Mədinəyə qayıtma. Çünki Mədinə İslam, hicrət, sünnət və səlam diyarıdır. Burada isə insanların heçbir şey bilməyən cahilləri vardır." [ Buxari ]

İbn Abbas (r.a) belə deyir: Rasulullah (s.ə.v) və Əbu Bəkir (r.a) mühacirlərdəndi. Çünki onlar şirk yurdu olan Məkkəni tərk etdilər. Ənsardan da mühacirlər vardır. Çünki ənsar, Mədinə şirk yurdu ikən aqabədə Rasulullahın yanına gəldilər." [ Nəsai ]

Diqqət edin. İbn Abbas r.a Məkkə fəth olunmamışdan qabaq oranı şirk yurdu adlandırır. Eynilə Mədinə hicrət yurdu olub, dövlət qurulmamışdan qabaqki vəziyyətini də bu cür adlandırır. Halbuki hər ikisində də müsəlmanlar yaşayırdı. Həm ayətlərdən, həm də Rasulullahın (s.ə.v) sünnəti və səhabənin mövqeyindən anladığımız üzərə Darlar iki qismdir:

2. Qayda: Darların isimləndirilməsindəki illət qələbənin/üstünlüyün kimə aid olduğudur. Bunun dəlilləri:"Rasulullah (s.ə.v) Xeybəri fəth etdikdə Xeybər əhli: "Biz buranı daha yaxşı bilirik. Çıxan məhsulun yarısını sizə vermək şərtilə burada qalaq" dedilər. Rasulullah da qalmalarına izin verdi. Xeybər əhlinim 95%-dən çoxunun kafir olmasına baxmayaraq fəthdən sonra daru'l İslam idi. Çünki Xeybər İslamın qələbəsi və hakimiyyəti altında idi. Eynilə Mədinədə yəhudilər, müşriklər və müsəlmanlar var idi. Və ora da daru'l islam idi. Çünki orada İslam qanunları hakim idi. Həmçinin Məkkədə hicrətdən əvvəl Rasulullah(s.ə.v), müsəlmanlar və müşriklər var idi. Lakin ora daru'l kufr idi.

3. Qayda: Daru'l küfrdən qəsd torpaq parçasını təkfir etmək deyil, oradakı xalqı təkfir etməkdir. "Mən sizə fasiqlərin yurdunu göstərəcəyəm." [ Araf 145 ]

Başqa ayətdə: "Əzab gəldiyi an, Yunusun qövmündən başqa, iman gətirib imanı özünə fayda verən bir məmləkət əhli olubmu? Yunusun qövmü iman gətirəndə onlardan dünya həyatında rüsvayçılıq əzabını sovuşdurduq və onlara müəyyən vaxta qədər fani nemətlərdən faydalanmaq imkanı verdik."[ Yûnus, 98 ]

4. Qayda: Hər bəldə öz idarəçisinin hökmünü alır. Yəni Daru'l Küfrdə başçının/idarəçinin hökmü nədirsə, islamını izhar edənlər istisna o diyarın bütün xalqı o hökümdarın hökmünü alır. Həmin ölkənin xalqına da kafir müamələsi edilir.

Dəlil: Peyğəmbər s.ə.v bir bəldə ilə savaşmazdan əvvəl oradakılarla tək-tək danışmamış, sadəcə o diyarın ümumi hökmünü nəzərə almışdır. Məsələn Rum hökmdarı Herakla göndərdiyi məktubda: "Müsəlman ol ki, səlamətdə qalasan. Əgər rədd etsən bütün xalqın məsuliyyəti də sənin üzərindədir." demişdi. [ Buxari ]

Rasulullah hər kəsə tək-tək məktub göndərməmişdir. Sadəcə hökümdara göndərmişdir. Çünki xalq hökümdarın hökmündədir. Həmçinin yalançı peyğəmbər Museyləmətu'l kəzzəb ortaya çıxdığı zaman Əbu Bəkir r.a öz xilafəti dövründə

onlarla savaşmış, və hərkəsə kafir müamələsi etmişdir. Ayrıca alimlər xalqın məlikin dini üzərində olduğuna icma etmişlər. Beləliklə xalq öz idarəçisinin hökmünə görə muamələ görər. Ancaq onun xilafını izhar edənlər istisnadır.

İndi isə bəzi alimlərin bu məsələ haqqında dediklərini nəzərinizə çatdıraq: İbnul Qeyyim əl Cəvziyyə: "Cumhur dedi: Daru'l İslam, müsəlmanların yaşadığı və üzərində İslam hökümlərinin icra edildiyi yerdir. Üzərində İslam hökümləri icra edilməyən yer, ona bitişik olsa belə Daru'l İslam olmaz! Ət-Taif Məkkəyə çox yaxın idi. Məkkənin fəthi ilə Daru'l İslam olmadı. Sahil də bunun kimi." [ Əhkamu Əhliz-Zimmə 2/728 (Daru ibni Hazm çapı) ]

Hənbəlilərin böyük alimlərindən Musa Həccavi (968h/1560m) Daru'l hərbi belə tərif edir: "Darul Hərb küfr hökmlərinin qalib olduğu yerdir." [ Əl İqna cild 2, Kitabul Cihad]

Qadı Əbi Yala Əl Hənbəli(vəfatı 458 hicri) bu barədə dedi: "İslam hökmlərindən başqa, küfr hökmlərinin qalib olduğu bütün torpaqlar Daru'l Küfrdür." [ Əl Muatəməd fi Usulid Din səh:276 ]

Zənnimcə bu qədər dəlil kifayətdir. Daru'l Küfrdə muamələyə gəlincə, birinə İslam muamələsi edə bilmək üçün ondaki İslam əlamətlərinə baxılar. Bəs İslam əlamətləri hansılardır? Zamana və yerə görə dəyişilirmi? Müvəffəqiyyət Allahdandır.

## İSLAM ƏLAMƏTLƏRİ

İslam əlamətləri bir kəsin və ya toplumun islamına hökm edilməsi, onunla müsəlman müamələsi edilməsi üçün izhar olunması gərəkən əlamətlərdir. Bu əlamətlər dəyişkən ola bilər. Çünki burada əsas olan əlamətlik vəsflərinin qorunmasıdır. Yəni kafir ilə müsəlmanın biri birindən ayırd edilə bilinməsidir. Beləliklə, əlamət- müsəlmanlarla kafirlər arasında ortaq olmayan əlamətlər olmalıdır. İndi isə izaha keçək: Rasulullah s.ə.v Məkkədə ikən insanlara: "Lə İlahə İllallah deyin qurtulun" deyərdi.[ İmam Əhməd, Müsnəd].

Bu kəliməni islam əlaməti sayardı. Mədinəyə gəldikdən sonra isə: "Mən insanlarla Lə ilahə İllallah və Muhammədun Rasulullah deyənə qədər vuruşmaqla əmr

olundum. Kim də onu söylərsə malını və qanını qorumuş olar. İslamın haqqı istisna, hesabları da Allaha aiddir dedi." [ Buxari ]

Çünki yəhudilər dildə "Lə ilahə illallah" deyir, lakin risaləti qəbul etmirdilər. Bu səbəblə də onların islamı üçün "Muhammədun Rasulullah" demələri şərt qoşuldu.

İslam dəvətinin 23-cü ilinə qədər həcc kimi bir ibadət islam əlaməti deyilkən , ondan sonra İslam əlaməti olaraq qəbul edildi. Çünki həcc ilk dönəmlərdə həm müsəlmanların həm də müşriklərin icra etdiyi bir ibadət idi. Ta ki, Uca Allah: "Bu ildən sonra müşriklər məscidil harama yaxınlaşmasınlar" [ Tövbə 28 ] ayətini nazil edənə qədər. Həcc sadəcə müsəlmanlara xas olduqdan sonra islam əlaməti olaraq qəbul edildi.

Həmçinin namaz da mütləq şəkildə islam əlaməti olaraq qəbul edilməmişdir. Necəki Rasulullah s.ə.v: "Kim bizim namazımızı qılar, qibləmizə yönələr, kəsdiyimizi yeyərsə o müsəlmandır "[Buxari] deyərək, bizim qıldığımız kimi namazı islam əlaməti olaraq qəbul etmişdir. Çünki müşriklər də özlərinə görə namaz qılırdılar."Onların beytin yanında qıldıqları namazları ancaq fit çalıb alqışlamaqdır.." [Ənfal 35 ]

Yenə yəhudilər və xristiyanlar da namaz qılırdılar. Ona görə də Allah Rasulu "bizim qibləmizə" və "bizim namazımızı" şərtini qoymuşdur. Deməli Allah Rasulu s.ə.v öz dövründə elə şeyləri İslam əlaməti təyin etmişdi ki, bunlar sadəcə müsəlmanlara aid olan və müsəlmanlar etdiyi zaman digər bütün millətlərdən onları ayıran şeylərdir. Səhabə və əhli sünnət alimlərinin cumhurunun da anlayışları bu şəkildədir. Necə ki, səhabə dönəmində zəkat verməyənlər və yalançı peyğəmbərə tabe olanlar "Lə ilahə illallah" deyir, namaz da qılırdılar. Amma Əbu Bəkir r.a bunları onların islamına əlamət qəbul etmədi. Onların islamına əlamət olaraq "bizim ölülərimiz atəşdə, sizin ölüləriniz isə cənnətdə" sözünü tələb etdi. Çünki bununla onlar içində olduqları küfrün xilafını izhar etmiş oldular.

# İşarələnmiş sözlərin İzahı

## *Drar Məscidi

Uca Allah Tövbə 107-ci ayədə deyir: “Müsəlmanlara zərər vurmaq, küfr etmək, möminlərin arasına təfriqə salmaq məqsədilə, əvvəlcədən Allaha və Onun Elçisinə qarşı müharibə edən kimsəni gözləmək üçün məscid tikənlər, əlbəttə: "Biz yaxşılıqdan başqa bir şey istəmədik"– deyə and içəcəklər. Allah şahiddir ki, onlar yalançıdırlar.”

Tövbə surəsi 108-ci ayədə isə: “Heç vaxt orada namaz qılma. İlk gündən təqva üzərində qurulmuş məscid, əlbəttə, içində namaz qılmağın üçün daha layiqdir. Orada təmizlənməyi sevən kişilər vardır. Allah da təmizlənənləri sevir.”

Allah bu ayələrdə bir məscidin drar olmasına dair 4 dənə şərt qoyub. Əgər bu şərtlərin hər hansı biri varsa o məscidlərdə namaz qılınmaz.

1-ci Müsəlmanlara zərər vurmaq.

2-ci Küfr etmək (inkar etmək).

3-ci Müsəlmanları bölmək.

4-ci Düşmənçilik etmək.

Bu şərtləri və ya şərtlərdən hər hansı birini özündə cəm edən Məscid, “Drar Məscidi” sayılır və Allah belə məscidlərdə müsəlmanlara namaz qılmağı qadağan edib. Bu gün bəzi özlərinə müsəlman deyənlər Allahın qadağa etdiyi məscidlərdə namaz qılırlar. İndi isə baxaq təfsir alimləri, Tövbə surəsi 107-ci ayəni təfsir edərkən nə deyiblər. Bu ayənin (Tövbə 107) bizim mövzu ilə əlaqadar olan yeri, “KÜFR ETMƏK“ hissəsidir.

İmam Qurtubi bu ayəni təfsir edərkən, ayədəki “inkar etmək” (küfr etmək) sözü üçün ayrıca bölüm açıb və orada yazır:Dırar məscidini tikənlər, nə Quba məscidinin, nə də Peyğəmbərin (sallallahu aleyhi va səlləm) məscidinin hörmətinə (möhtərəmliyinə) etiqad etmədiklərindən və bu möhtərəmliyə olan inancı inkar etmiş olduqlarından ötəri Uca Allah: "İnkar etmək..." deyə buyurmuşdur. Bir başqa

görüş isə belədir: "İnkar etmək" sözündə qəsd, Peyğəmbəri (sallallahu aleyhi va səlləm) və onun gətirdiklərini inkar etməkdir. Bu şərhi də əl-Kuşeyri və başqaları etmişdir. (Qurtubi təfsiri, Tövbə 107, əl-Camiuli- Əhkamil-Quran 8/398)

Bugünki Məscidlər Allah Rasulunun (sallallahu aleyhi va səlləm) dövründəki Drar məscidlərinin halına gəlmişdir.Həmin Məscidlərdə, ALLAHIN hökmü İlə hökm etməyən kafirə, onun əhlinə və bayrağına dua edirlər, və üstəlik də tağut yolunda ölən kəslərə "şəhid" ismi verərək onların cənazəsinə namaza qılıb onların adına dua edirlər.

Bu Məscidlərdə imamlar və ya mollalar, Allahın kitabında olan Haqqı insanlardan gizlədirlər."Şübhəsiz ki, Allahın nazil etdiyi kitabda olanları gizli saxlayanlar və bununla cüzi miqdarda pul əldə edənlər öz qarınlarına oddan başqa bir şey doldurmurlar. Qiyamət günü Allah onları danışdırmaz və onları təmizə çıxarmaz. Onlar üçün ağrılı-acılı bir əzab vardır.[ Baqara 174]. Üstəlikdə Allah subhanəhu və təalə Onun ayələrini, yəni haqqı gizlədənləri bu cür şiddətlə lənətləyir: Kitabda insanlara bəyan etdiyimiz açıq-aydın dəlilləri və doğru yol göstərən ayələri nazil etdikdən sonra onları gizli saxlayanlara həm Allah lənət edir, həm də lənət edə bilənlər lənət oxuyurlar! [Baqara,159]

Tağutu inkar etmədikləri səbəbiylə iman iddiaları keçərsiz olan bu imamların arxasında namaz qılınmaz. Lakin iman iddiasında olan bir çoxu bu məscidlərə gedir və üstəlikdə o bəlamların arxasında namaz qılırlar. Bu bəlamlar isə onlara “Tağutun” nə olduğunu heç başa salmır və üstəlikdə Məscidlərdə bu barədə danışmağa qadağa qoyulub. Halbu ki, bir insanın müsəlman olması üçün əvvəl Tağutu inkar (küfr) edib, sonra isə Allaha iman gətirməsi lazımdır. Necə ki Uca Allah deyir: “Biz hər ümmətə: "Allaha ibadət edin, TAĞUTDAN uzaq olun"– deyə, elçi göndərdik. Onlardan kimisini Allah doğru yola yönəltmiş, kimisinə də azmaq nəsib etmişdir. Yer üzündə gəzib dolaşın və görün haqqı yalan sayanların aqibəti necə oldu!” [Nəhl 36]

****Bəlam kimdir?**

Tağutlara xoş olsun deyə Allahın dinini pozmağa çalışan və din adamı görkəmində fəaliyyət göstərən adamlara bəlam deyilir. Dünyəvi çıxar və hesablar üçün Allahın

dinini təhrif edən bir elm və din adamını küfr sistemlərinə və kafir idarəçilərə yararlı olmaq məqsədi ilə Allahın hökmlərini tapdalayan və əsl məqsədindən azdıran kəsləri təmsil etməkdədir. Bu Bəlam ibn Bauranın adı ilə bağlıdır.

**Bəlam İbn Baura kimdir?**

Musa (əleyhissalam)ın zamanında yaşamış və sonradan irtidat etmiş olan elm adamı. Rəvayətə görə Musa kənanıların Şamdakı torpaqlarına girmişdi. Bu sırada Bəlam, əl-Belka kəndlərindən Balada olurdu. Kənanlılardan bəziləri Bəlamın yanına gələrək: "Ey Bəlam, Musa İbn İmran İsrailoğullarının başında olduğu halda bizi yurdumuzdan çıxarmaq və öldürmək üçün gəldi. Bizim ölkəmizə İsrailoğullarını yerləşdirəcək. Sənin qövmün olan bizlərin isə yerləşəcək bir yerimiz yoxdur. Sən duası qəbul edilən bir kimsəsən. Onları dəf etməsi üçün Allaha dua et" dedilər. Bəlam: "Vay sizin halınıza! O Allah elçisidir; mələklər və möminlər də onunla bərabərdir; onlar əleyhinə necə dua edə bilərəm! Bildiyimi mənə Allah öyrətdi" deyə rədd cavabı verdi. Qövmü dua etməsi barəsində israr etdilər.Bəlam, Allahu təalanın peyğəmbərinə qarşı qarğış edə bilməyəcəyini bildirdisə də, azğın və imansız Belka şəhərinin əhalisi qarğış etməsi üçün daha çox israr etdilər. Bəlam ibn Bauraya hədiyyələr gətirib bir çox dünyalıq vəd etdilər. Arvadı da; "Əgər bu qövmün torpaqlarımızdan getməsi üçün dua etməsən səndən ayrılacağam!" deyə bildirdi. Zalım hökmdar da qarğış etmədiyi təqdirdə onu edam edəcəyini söyləyərək edam stulu qurdurdu. Bütün bunlar qarşısında Bəlam ibn Bauranın könlündə dünya malına və sərvətinə qarşı meyl meydana çıxdı. Bəlam, eşşəyinə minərək, İsrailoğullarının çıxmaqda olduğu dağa doğru irəlilədi. Bu dağ, Husban dağı idi. Bir az getdikdən sonra eşşəyi yerə çökdü. Eşşəyinə minərək bir az irəlilədikdən sonra heyvan yenə çökdü. Bəlam bir az əvvəlki kimi hərəkət etdikdən sonra təkrar heyvanına mindi. Bir az yol getdikdən sonra eşşək yenə çökdü. O, yenə eşşəyi yerindən qalxana qədər döydü. Nəhayət eşşək, Bəlam əleyhində bir dəlil olsun deyə, Allahın icazəsi ilə danışaraq belə dedi: "Ey Bəlam, hara gedirsən? Mələklərin önümdə dayanaraq məni yolumdan çevirdiklərini görmürsən? Allah elçisi ilə möminlər sənin qövmün əleyhinə dua etməkdədirlər. Lakin Bəlam, buna diqqət etmədən eşşəyini döyərək yoluna davam etdi. Nəhayət eşşək onu Husban dağına çıxardı, Musanın ordusunun və İsrailoğullarının qarşısına apardı. Bəlam onlara qarğış etməyə başladı; lakin Musanın ordusuna qarğış edərkən Allah onun

dilini öz qövmü əleyhinə çevirdi. Yanında olan xalq, onun öz əleyhlərinə qarğış etməkdə olduğunu görüncə: "Ey Bəlam! Nə etdiyini bilirsənmi? Sən İsrailoğullarına xeyir-dua edib, bizə qarğış edirsən" dedilər. O: "Mən bunu öz iradəmlə etmirəm, Allah dilimə hakim oldu" dedi. Bunun üzərinə dili ağzından çıxaraq sinəsi üzərinə sallandı. Sonra qövmünə: "Dünya və axirət mənim əlimdən getdi, artıq hiyləyə müraciyət etməkdən başqa çarə yoxdur" dedi.İbrətlik hala düşən Bəlam Quranda belə anılır: "Onlara ayələrimizi verdiyimiz kimsənin əhvalatını oxu. O, ayələrdən kənara çıxdı, şeytanın təqibinə məruz qaldı, axırda da azanlardan oldu. Biz istəsəydik, bunun sayəsində onu ucaldardıq. Lakin o, dünyaya meyl saldı və öz istəyinə uydu. Onun məsəli itin məsəlinə bənzəyir; onu qovsan da dilini çıxardıb ləhləyər, qovmasan da. Ayələrimizi yalan hesab edənlərin məsəli belədir. Bu əhvalatları (onlara) danış ki, bəlkə fikirləşələr." (Əraf surəsi 175-176)

Allah sənə rəhm etsin! Bil ki, bunları öyrənib fəhm etməyin, bununla əməl etməyin, sənin üçün dünya və içindəki dünyalıqlardan daha xeyirlidir. Çünki dünya nemətləri fani, axirət yurdu isə əbədidir. Allahu Əzzə və Cəllə bizləri və bu yazını oxuyanları Tövhid üzərə yaşatsın və canımızı da tövhid üzərə alsın. Amin!